# Mündəricat

# QURANİ–KƏRİMİN «NÜMUNƏ» TƏFSİRİ ƏSASINDA ١٧٠ SUAL–CAVAB

## Kitab haqqında

Bismillahirrəhmanirrəhim

Tərtib edən: Məhəmməd Azəri

Kitabın adı:..........١٧٠ Sual–cavab

Müəllif:..............Məhəmməd Azəri

Naşir:...........................................Faiz

Çap növbəsi:........................Birinci

Tiraj:...........................................٥٠٠٠

Çap tarixi:..................................٢٠٠٥

səh:١

## Sual ١

Sual ۱: Nə üçün zalım və günahkar insanlardan bir hissəsi nemətlər içində qərq ?olmuşdur

Cavab: Yuxarıdakı sual çoxlarını düşündürür. Qurani-kərimin ayələrinə əsasən, belələri islahedilməz olduqlarından, yaranış qanunları və iradə azadlığına əsasən öz başına buraxılmışlar. Allah tərəfindən verilmiş bu möhlət, əslində onları uçuruma aparır. «Ali-imran» surəsinin ۱۷۸-ci ayəsində buyurulur: «Küfr edənlər, onlara verdiyimiz möhləti özləri üçün xeyirli bilməsinlər. Biz onlara möhlət verimişik ki, günahlarını daha .«da artırsınlar. Onlar üçün zəliledici bir əzab vardır

Bəzi ayələrdən məlum olur ki, bəzən Allah zalım və günahkarlara verdiyi nemətləri hədsiz dərəcədə artırır və onlar ləzzət içində xumarlandıqları zaman, qəfildən onları bütün nemətlərdən məhrum edir. Misilsiz firavanlıqdan sonra qəfil səfalət və zəlalət həmin insanlar üçün böyük əzaba çevirilir. «Ənam» surəsinin ۴۴-cü ayəsində oxuyuruq: «Onlar edilmiş xəbərdarlıqları unutduqları bir an bütün nemət qapılarını onların üzünə açdıq ki, şadlansınlar. Sonra isə qəfildən bütün verdiklərimizi geri aldıq. Bununla da, .«onlar hədsiz narahatlığa düçar oldular

Təsəvvür edin ki, bir zalım, kövrək budaqları qıra-qıra üzüyuxarı, dayanmadan ağaca dırmaşır. Yuxarı qalxdıqca, daha da şad olur. Anlamır ki, nə qədər yuxarıdan yıxılsa, bir o qədər də çox əziləcəkdir. Qəfil tufan qopur və bir an əvvəl şadlıqdan oynayan .sümüklər yerə qaxılıb, xıncım-xıncım olur

### Sual ۲

?Sual ۲: Hal-hazırda behişt və cəhənnəm mövcuddurmu

Cavab: Əksər İslam alimlərinin fikirinə görə, hal-hazırda həm behişt, həm də cəhənnəm mövcuddur. Qurani-kərimin müxtəlif ayələrində bu fikir yetərincə aydın təsdiqlənir. «Tövbə» surəsinin ۸۹-cu ayəsində buyurulur: «Allah onlar üçün əbədi .«qalacaqları, altından çaylar axan cənnətlər hazırlamışdır

Başqa bir surədə oxuyuruq: «And olsun ki, başqa bir dəfə (Məhəmməd əleyhissəlam Cəbrail mələyi) əbədi behiştdə yerləşdiyi Sidrətül-Müntəhanın yanında görmüşdür»(۱). .Qeyd edək ki, bu ayələr Peyğəmbərin (s) merac səfərinə aiddir

Təkasur» surəsində isə belə buyurulur: «Əgər elmül-yəqinə malik olsaydınız, mütləq» .(cəhənnəmi müşahidə edərdiniz»(۲

Behişt və cəhənnəmin hal-hazırda mövcudluğunu təsdiq edən mötəbər hədislər kifayət qədərdir. Bu hədislər arasında Merac hədisləri xüsusi yer tutur. Mövcudluğuna dəlillər gətirdiyimiz, bir zaman Adəmin olduğu behişt deyildir. Bu günki behişt və .cəhənnəm, insanların xeyir və şər əməllərindən asılı olaraq genişlənməkdədir

### Sual ۳

?Sual ۳: Hansı şəxslərdən məsləhət almaq olar

Cavab: Şübhəsiz ki, hər adamla məsləhətləşmək insana xeyir gətirməz. Xaraktercə zəif və nöqsanlı məsləhətçinin göstərdiyi yol, insanı uçuruma apara bilər. Əli (ə) buyurur: «Üç qəbil insanla məsləhətləşmə: Paxıl, qorxaq və tamahkar insanlarla. Paxıl səni kasıbçılıqla qorxudub



---

.Nəcm» surəsi, ayə ۱۳-۱۵» [۱] -۱

.Təkarus» surəsi, ayə ۵-۷» [۲] -۲

başqalarına əl tutmaqdan çəkindirər. Qorxaq mühüm işlərin yerinə yetirilməsinə mane olar. Tamahkar isə, var-dövlət və vəzifə qazanmaq xatirinə, zülmə mərhəmət donu .(geyindirər»(١

İslam dinində məsləhət istəyən adama xəyanət edib səhv yol göstərmək, böyük günahlardan hesab olunur. Bilmədiyin bir işdə, hətta qeyri-müsəlmana məsləhət .vermək böyük günahdır

İmam Səccad (ə) buyurur: «Səndən məsləhət istəyənə bildiyin işlərdə məsləhət verməli, bilmədiyin məsələlərdə onu bilən şəxsin yanına göndərməlisən. Məsləhət .(aldığın adamı, könlünə yatmayan məsləhətinə görə, qınamamalısan»(٢

**Sual ۴**

?Sual ۴: Adəmin övladları kiminlə evləndi

Cavab: «Nisa» surəsi bu ayə ilə başlayır: «Sizi tək bir şəxsdən xəlq edən, ondan zövcəsini .«yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun

İslam düşmənlərinin fəaliyyət istiqamətlərindən biri də, mübahisə doğura biləcək dini məsələri savadsız müsəlmanlar arasında qızışdırmaqdır. Yuxarıdakı ayə, dinini sevən insana kifayət qədər mə´lumat verir. Buna baxmayaraq, İslam alimləri ayə və .hədislərə əsaslanaraq, şübhə doğracaq bütün məsələlərə aydınlıq gətirirlər

Bir qrup alimin fikrinə görə, Adəmin övladları Adəmdən əvvəlki insan nəslinin qalıqları ilə evlənmişlər. Rəvayətlərə görə, Adəm yer üzündə heç də ilk insan olmayıb. Elm də bu fikri təstiqləyir. Qədim insan məskənlərində aparılan tə´diqatlar göstərir ki, yer üzündə



---

.«Nəhcül-bəlağə» [۳] -۱
.Təfsiri Nurus-səqəleyn, ۱-ci cild, səh. ۴۰۵ [۴] -۲

həyat milyonlarla il bundan əvvəl başlamışdır. Hansı ki, Adəmin, yaranışından elə də böyük zaman keçməmişdir. Təbii ki, həmin nəsil Adəmin yaranış zamanında öz son günlərini yaşayırdı. Adəmin övladlarının həmin insanlarla evlənməsi tam məntiqə .uyğundur

**Sual ۵**

Sual ۵: Dəstamaz və ya qüsl əvəzinə əlləri torpağa vurub alın və əllərin üstünə ?çəkməyin faydası nədir

.Cavab: Yəqin ki, söhbətin təyəmmümdən getdiyini anladınız

Təyəmmümün ilkin faydası odur ki, ibadət üçün dəstəmaz almağa və ya qüsl verməyə imkanı olmayan şəxs, ibadətini təxirə salmır. İnsanın alnı, onun ən şərafətli bədən .nahiyələrindəndir. İnsan öz kiçikliyini etiraf edir. Demək, təyəmmüm özü bir ibadətdir

Artıq elmi dəlillərlə sübuta yetirilib ki, torpaq güclü parçalama xüsusiyyətinə malikdir. Məhz bu xüsusiyyətinə görə, insan və heyvan cəsədləri torpaqda dəfn olunur. İstənilən başqa mühitdə qorxulu keçici xəstəliklər törədə biləcək cəsədlər, qısa bir müddətdət torpağın təsiri ilə parçalanır və zərərsizləşdirilir. Buradan belə nəticə çıxır ki, torpaq da, su kimi özünəməxsus təmizləyici keyfiyyətlərə malikdir. Tibbi nöqteyi-nəzərdən təmiz və günəşli hava altında olan torpaq təyəmmüm üçün daha da yararlıdır. «Maidə» surəsinin ۶-cı ayəsində buyurulur: «...Su tapmasanız, pak torpaqla təyəmmüm edin, ondan üzünüzə və əllərinizə çəkin. Allah sizi çətinliyə salmaq istəməz. .«Lakin o sizi pak etmək, sizə olan nemətini tamamlamaq istəyir ki, bəlkə şükr edəsiniz

**Sual ۶**

?Sual ۶: Zalımı bağışlamaq olarmı

:Cavab: Qur´anda bu barədə belə buyurulur

.(Nə zülm edin, nə də zülmə baş əyin»(۱)

.(Bağışlamağınız müttəqiliyə daha yaxındır»(۲)

.(Bağışlasınlar! Allahın sizi bağışlamağını istəmirsiniz?»(۳)

Həzrəti Əli (ə) «Nəhcül-bəlağə»də buyurur: «Allahın hökmünə baş əyəcəkləri ana qədər .«zalımlarla vuruşun

İlk baxımdan belə görünə bilər ki, bəzən «vuruş», bəzən isə «bağışla» deməklə, yuxarıdakı göstərişlər arasında ziddiyyət vardır. Qeyd edək ki, bağışlamağın şəraiti vardır. O zaman bağışlamaq olar ki, bağışlanan tərəf sui-istifadə edib, öz zülmünü artırmasın. Başqa bir tərəfdən, düşmən yalnız son və qəti qələbədən sonra bağışlana .bilər. Çünki tam məğlub edilməmiş düşməndən yeni təhlükələr gözlənilir

Həzrət Əli (ə) buyurur: «Düşmənə qalib gələndə, bu qələbənin zəkatı olaraq onu .(bağışla»(۴

Amma gücdən düşməmiş düşməni bağışlamaqla, insan zülmə razı olanlardan hesab .edilə bilər

### Sual ۷

?Sual ۷: Allah öz bəndəsini daş ürəkli edərmi

Cavab: Allah-təala Quranın bəzi ayələrində kimlərinsə qəlbini daşa döndərdiyini xəbər ?verir. Bir halda ki, bu iş Allah tərəfindən baş verir, insan nə üçün günahkar sayılmalıdır

Diqqət etsək, görərik ki, ürəyin daşa dönməsi Allah tərəfindən bir cəzadır. Demək, insan Allahın qəzəbinə səbəb olacaq günahlara yol verir və daşürəkliliklə :cəzanlandırılır. Məsələn, «Tövbə» surəsinin ۷۷-ci ayəsində belə buyurulur



---

.Bəqərə» surəsi, ayə ۲۷۹» [۵] -۱

.Bəqərə» surəsi, ayə ۲۳۷» [۶] -۲

Allaha verdikləri vədə xilaf çıxdıqlarına görə, Allah da onların ürəklərinə qovuşacaqları» qiyamət gününə qədər nifaq saldı». «İbrahim» surəsinin ٢٧-ci ayəsində isə belə deyilir: «Allah iman gətirənləri dünyada və axirətdə möhkəm bir sözlə sabit qədəm edər. Allah .«zalımları yolundan azdırar

İnsanın öz əməlindən doğan bu pis nəticə, onun iradə azadlığına qətiyyən zidd deyildir. Məsələn, spirtli içki içən insan anlamalıdır ki, ağlı başından çıxacaq və üzünə cinayət qapıları açılacaq. Məsələn, adam öldürəcək. Bu şəxs sərxoş olduğunu bəhanə gətirib, .adam öldürmək fikirində olmadığını iddia etsə də, məsuliyyətdən qaça bilməz

Allah-təalanın bir insanı doğru yola yönəldib, o birini zəlalətə salmasının əsil səbəbi, .həmin insanların əvvəlki xeyir və ya şər əməllərində axtarılmalıdır

**Sual ٨**

?Sual ٨: Nə üçün insanlar fərqli doğulur

Cavab: Əgər Allah ədalətlidirsə, nə üçün biri istedadlı, o biri isə istedadsız, biri gözəl, o ?biri isə çirkin doğulur

İnsanların fərqli doğulmasının bir səbəbi, ictimai və fərdi çatışmamazlıqlarıdır. Məsələn, var-dövlətli insanların övladları fəqirlərin övladlarına nisbətən sağlam, gözəl və istedadlı olurlar. Cəmiyyəti varlı və kasıba bölən isə, Allah deyildir. Amma insanlar arasındakı fərqlərin bir hissəsi yaranış qanunlarından doğur. Əgər insanlar fərqləndirilməsəydilər, bir zavodun istehsal etdiyi məhsul kimi bir-birlərinə oxşayar və !?həyat maraqsız olardı. Dünyada iki tam eyni insanın olmaması gözəllik deyilmi

Bir şeyi də qeyd edək ki, cəmiyyət də insan orqanizmi kimi müxtəlif əzalara ehtiyaclıdır. Kamil insanın gözə, qulağa, dilə ehtiyacı olduğu kimi, kamil cəmiyyət də müxtəlif sahələrdə zövqlü və istedadlı insanlara

ehtiyaclıdır. Amma bu o demək deyil ki, bəstəkar yaxşı yaşamalı, fəhlə isə, kasıbçılıqla ömür sürməlidir. İnsanın qəbul etdiyi qidanın enerji orqanizmin bütün üzvlərinə paylandığı kimi, cəmiyyətin də qazancı bütün təbəqələrin ehtiyaclırın ödəməlidir. Cəmiyyətdə memarın öz, fəhlənin də öz iş sahəsi var. Hər bir insan Allahdan aldığı .istedad payı qədərində də məsuliyyət daşıyır

**Sual ۹**

?Sual ۹: Hidayət nədir

Cavab: «Hidayət» doğru yola yönəltmə, doğru yol göstərmə mənasını verir. «Ta-ha» surəsinin ۵۰-ci ayəsində buyurulur: «Allahımız hər şeyi yaratdı, sonra isə, onları hidayət .«etdi

Hidayət» kəlməsinə Quranın müxtəlif yerlərində tez-tez təsadüf olunur. Bu söz» :əsasən, iki mənada işlənmişdir

Təkvini hidayət .۱

Təkvini hidayət dedikdə, bütün varlıq aləminin tabe olunduğu nizam nəzərdə tutulur. Allah-təala öz xilqətini, canlı və cansız aləmi yaranış qanunlarına uyğun olaraq hidayət edir. Canlı aləmin təbii artımı, ulduz və planetlərin nizamlı hərəkəti, təkvini hidayətin .nümunələrindəndir

Təşri´i hidayət .۲

Təşri´i hidayət peyğəmbərlər, asimani kitablar vasitəsi ilə həyata keçir. İnsanlar peyğəmbərlər və kitablardan təlim-tərbiyə almaqla, təkamül yolunda irəliləyirlər. «Ənbiya» surəsinin ۷۳-cü ayəsində oxuyuruq: «Biz, onları əmrimizlə insanları doğru yola yönəldən imamlar etdik. Biz, onlara xeyirli işlər görməyi, namaz qılıb, oruc tutmağı .«vəhy etdik

Ayə və hədislərdən belə məlum olur ki, təşri´i hidayət, başqa sözlə peyğəmbərlər və .asimani kitablar yalnız imanlı insanlara təsirli ola bilir

**Sual ١٠**

?Sual ١٠: Allah şeytanı nə üçün yaratdı

Cavab: Tez-tez belə suallarla qarşılaşırıq: Şeytan kimi alçaq bir vücudun yaradılması, ?hansı məntiqə əsaslanır

İlk əvvəl onu qeyd edək ki, Allah-təala şeytanı alçaq yaratmamışdır. Mötəbər dini mənbələrin verdiyi məlumatlara görə, şeytan uzun illər mələklərlə yanaşı dayanmışdır. Lakin sonradan verilmiş azadlıqdan sui-istifadə edərək, tüğyan qoparmışdır. Demək, şeytan ilk əvvəl pak yaradılmış, sonradan öz istəyi ilə azğınlığa .düçar olmuşdur

İkinci bir tərəfdən, yaranış qanunlara əsasən, ziddiyyət olmayan yerdə tərəqqi də olmaz. Şeytanın varlığı imanlı insanlar üçün qorxulu deyildir. Əksinə, onun törətdiyi .fitnə-fəsadlar, imanlı insanların təkamülü üçün mühüm şərtlərdəndir

İnsan yalnız güclü düşmənlə qarşılaşdığı zaman öz qüvvəsini səfərbər edib, işə sala bilər. Tarixə baxın. Yalnız güclü düşmənlərin hücumları qarşısında ardıcıl müqavimət .göstərmiş millətlər, böyük mədəniyyət yarada bilmişlər

Nəhl» surəsinin ٩٩ və ١٠٠-cü ayələrində buyurulur: «Həqiqətən, iman gətirib, yalnız öz» Rəbbinə təvəkkül edənlərin üzərində şeytanın heç bir hökmü yoxdur. Şeytanın hökmü .«yalnız ona itaət edib, Allaha şərik qoşanlar üzərindədir

**Sual ١١**

?Sual ١١: İblis nə üçün Allaha itaət etmədi

Cavab: «İblis» ilk dəfə Adəmə səcdədən boyun qaçıran şeytanın adıdır. «Kəhf» surəsinin .«٥٠-ci ayəsində buyurulur: «Cin tayfasından olan İblisdən savayı, hamı səcdə etdi

Ayədən göründüyü kimi, Adəmə səcdə edilməsi əmri gələn zaman, mələklərlə bir .sırada dayanmış İblis mələk yox, cin tayfasından imiş

O, elə təsəvvür edirdi ki, Adəmdən üstündür və o, Adəmə yox, Adəm ona səcdə etməlidir. Onun bu itaətsizliyi, sadəcə bir etiraz yox, ciddi etiqad məsələsi idi. Bir ömür ibadət etmiş, öz ibadəti sayəsində mələklər cərgəsinə qoşulmuş İblis, öz təkəbbürü .ucbatından anlamırdı ki, əslində Adəmə yox, Allaha səcdədən boyun qaçırır

Şəksiz ki, Allahın əmrinə boyun əyib, Adəmə səcdə edən mələklər, əslində Allaha .səcdə edirdilər. İblis isə səcdədən boyun qaçırmaqla, Allahın qəzəbinə düçar oldu

İblisin insan övladı ilə düşmənçiliyi, bu gün də davam etməkdədir. Adəm və onun övladlarını qiyamət gününədək doğru yoldan azdıracağına and içmiş İblis, öz rəngarəng vəsvəsələri ilə insanları əbədi behiştdən məhrum edir. O heç zaman düşmən qiyafəsində gəlmir. Necə ki, Adəmi öz andları ilə xeyirxah olduğuna inandırıb .çaşdırmışdısa, Adəm övladlarını da eyni üsulla günaha sürükləyir

### Sual ۱۲

?Sual ۱۲: Təqva nədir

Cavab: Qurani-kərimdə çox təsadüf olunan sözlərdən biri də, «təqva»dır. Allah-təala öz .bəndələrini təqvalı olmağa çağırır

Təqva» sözü lüğətdə özünü qorumaq, çəkinmək mə´nasını daşıyır. Başqa sözlə təqva,» insanı nəfs istəklərindən çəkindirə biləcək daxili bir qüvvədir. Həzrəti Əli (ə) buyurur: .««Bilin ey Allah bəndələri, təqva möhkəm və keçilməz bir qaladır

Bə´ziləri təqvanı tikanlıqdan keçərkən ətəyini yığıb, çox ehtiyatla addımlarını atan insanın qorunmasına

oxşadırlar. «Təqva kiçik və böyük günahlardan uzaqlıqdır», deyənlər də olub. Kiçik günahlara tez-tez yol verən insanlara «dağlar da kiçik daşlardan düzəlir» deyə, təqvaya çağırışlar olur. Əli (ə) buyurmuşdur: «Təqva bütün bağlı qapıların açarı, axirət ehtiyatı, şeytana nökərlik və bəlalardan qurtuluş yoludur»(١).

Onu da qeyd edək ki, təqva müxtəlif sahələri əhatə edir. İnsanın iqtisadi, cinsi, ictimai, siyasi məsələlərdə təqvalı olması, bütün sahələrdə Allahdan çəkinməsi, onun kamala yetişməsinin zəruri şərtidir.

### Sual ١٣

Sual ١٣: «Liqaullah» nədir?

Cavab: Qurani-kərimdə qarşılaşdığımız kəlmələrdən biri də, «liqaullahdır». Liqaullah, ərəb dilindən tərcümədə «Allahla görüş» mənasını verir. Allah-təala cism olmadığımızdan onun adi gözlə görünməsi də, sözsüz ki, mümkün deyildir. Liqaullah dedikdə, qiyamət səhnəsində Allahın qüdrətinin müşahidəsi nəzərdə tutulur. Allahın mükafat, cəza, nemət və əzabı bu qüdrətin təzahürlərindəndir.

Bu sözün başqa bir mənası da zahir yox, iç gözü ilə Allahın varlığına şahid olmaqdır. İnsan elə bir kamillik mərtəbəsinə çata bilər ki, Allah-təalanı sanki qəlb gözü ilə görər və onun varlığına bir zərrə də olsun şəkki qalmaz. Əlbəttə ki, bu hala yalnız yüksək paklıq, təqva yolu ilə yetişmək olar. «Nəhcül-bəlağə»də oxuyuruq: «Dostlarından biri Həzrəti Əlidən (ə) soruşdu: «Allahını

görmüsənmi?». Həzrət (ə) bu sualın cavabında buyurdu: «Görmədiyim Allaha necə ibadət edərdim?! Zahirdəki gözlər heç zaman onu görməz. Yalnız iman nuru vasitəsi ilə qəlblər onu dərk edər».



---

١- [٩] «Nəhcül-bəlağə».

Liqaullah haləti, qiyamətdə hamıya müəssər olar. Çünki qiyamət səhnəsində Allah-
.təalanın qüdrəti, hətta kor qəlbləri dirildəcək qədər aşkarlanar

### Sual ۱۴

?Sual ۱۴: Donuz əti nə üçün haramdır

Cavab: «Bəqərə» surəsinin ۱۷۳-cü ayəsində belə buyurulur: «Allah sizə ölmüş heyvanı,
.«qanı, donuz ətini və Allahdan başqasının adı ilə kəsilənləri yeməyi qəti haram etmişdir

Artıq sübut edilmişdir ki, insanın qəbul etdiyi qidalar, onun ruhiyyə və əxlaqında təsirlər qoyur. Bir hədisdə belə buyurulur: «Qan içən insanların qəlbi o qədər daşlaşır ki, öz ata-
.(analarını, övladlarını qətlə yetirməkdən belə çəkinmirlər»(۱

Donuz ətindən ən çox istifadə edən avropalılar arasında donuz, qeyrətsizlik simvoludur. Əgər heyvanat aləminin cinsi həyatını diqqətlə izləyə bilsək, donuzun cinsi həyatında heç bir hədd-hüduda təsadüf etmərik. Donuz ətindən istifadə edən
.insanlar, adətən, ailədə namus məsələlərinə biganə olur

Donuz ətini Həzrəti Musa (ə) da haram bildirmişdir. İncildə günahkarlar donuza
.oxşadılır və məhz bu heyvan, şeytanın təcəssümü hesab edilir

Bu heyvan çox vaxt öz ifrazatı ilə qidalandığından, insan sağlamlığı üçün çox qorxulu olan iki növ parazit daşıyıcısıdır. Bir ayda on beş min yumurta qoyan bu qurdlar insan orqanizminə düşdükdə, qan çatışmamazlığı, dizenteriya, revmatizm və bir çox digər xəstəliklərə səbəb olur. ۱ kq donuz ətində həmin qurdlar ۴۰۰ milyon yumurta qoya bilir.
Bir çox ölkələrdə, o cümlədən Rusiyada uyğun səh:۱۳

---

.Vəsailuş-şiə», ۱۶-cı cild, səh. ۳۱۰» [۱۰] -۱

xəstəliklər səbəbindən qısa müddətli də olsa, dəfələrlə donuz ətinin istifadəsi qadağan .edilmişdir

## Sual ۱۵

?Sual ۱۵: Bəni-İsrailin inək macərasında nədən danışılır

Cavab: Qurani-kərimin «Bəqərə» surəsində rastlaşdığımız bu əhvalat öz riyakarlığı ilə Musa peyğəmbərə (ə) olmazın əziyyətlərini verən yəhudilərin iç üzünü açır, onların .iman dərəcəsini göstərir

Macəra belə baş verir: Bəni-İsraildə bir nəfər qətlə yetirilir. Qəbilələr arasında qatilin kimliyi ilə əlaqədar güclü qarşıdurma yaranır. Tayfalar bu işdə bir-birlərini ittiham edirlər. Nəhayət, qərara gəlirlər ki, bu mübahisədə hakimliyi Musaya həvalə etsinlər. Musa öz qövmünə deyir: «Allah sizə bir inək kəsmənizi əmr edir». Onlar Musaya itaət etmək əvəzində «bizi məsxərəyəmi qoyursan», «o inək nə cür olmalıdır», «onun rəngini bizə bildir» və başqa bu kimi yersiz suallarla söhbəti uzadırdılar. Nəhayət, inək kəsilir və Allahın əmri ilə onun ətindən bir parçası ölüyə toxundurulur. Qətlə yetirilmiş şəxs dirilir. Uyğun surənin ۷۲-ci ayəsində buyurulur: «Yadınıza salın ki, siz o zaman bir nəfəri öldürüb, onun qatili barəsində mübahisə edirdiniz. Allah gizlətdiyinizi aşkara .«çıxarandır

## Sual ۱۶

?Sual ۱۶: Münafiq kimdir və onu necə tanımalı

Cavab: Qurani-kərimdə insanların üç qismə - mömin, münafiq və kafir təbəqələrinə bölündüyünü bilirik. O da məlumdur ki, Allaha həqiqi iman gətirənlər mömin, Allahın varlığını inkar edənlər isə, kafir adlanır. Bəs münafiq kimdir? «Münafiq» sözü riyakar, ikiüzlü mənalarını verir. Quran ayələrində bu təbəqə haqqında belə buyurulur: «Allah münafiqlərin xalis yalançı olduqlarına şəhadət səh:۱۴

.«verir», «Onlar dildə iman gətirdilər, qəlblərində isə kafir oldular

Bütün dövr və cəmiyyətlərdə münafiqlər olmuşdur. Onlar həmişə insanlar arasında nifaq salmış, öz gizli düşmənçilikləri ilə İslam dininə kafirlərin vura bilməyəcəkləri .zərbələri vurmuşlar

Bəs onları necə tanımalı? Ayə və hədislərə əsaslanaraq, münafiqlərə məxsus beş sifəti :qeyd etmək olar

Böyük iddialarda olar, çox danışıb, az əməl edərlər .١

Bir mühitə düşdükdə o mühitin rəngini alar, həmin cəmiyyətin xoşladığı sözləri . ٢ danışar, möminlərə «biz iman gətirdik», müxaliflərə «biz sizinləyik» deyərlər

Özlərini xalqdan ayırar, gizli məclis və cəmiyyətlər təşkil edərlər .٣

;Hiyləgərlik edər, yalan danışar, yağlı dilini işə salar, xəyanət edərlər .۴

.Özünü elmli, xalqı cahil, özünü ağıllı, xalqı isə, axmaq hesab edər .۵

**Sual ١٧**

?Sual ١٧: Nə üçün duamız qəbul olmur

Cavab: Bütün çətinliklər qarşısında duadan yetərincə güc almağın mümkünlüyünə kifayət qədər dəlillər vardır. Bəs nə üçün bəzən dualarımız qəbul olmur? Həzrəti Əli (ə) duanın qəbul olmasının səbəblərini belə bəyan edir: «Dualarınız ona görə qəbul olmur ki, qəlbiniz səkkiz halda xəyanət etmişdir: Allah-təalanı tanıdınız, amma onun haqqını yerinə yetirmədiniz; Göndərdiyi Peyğəmbərə (s) iman gətirdiniz, sonra onun buyurduqlarına müxalif oldunuz; Quran oxudunuz, amma ona əməl etmədiniz; Dediniz Allahın əzabından qorxuruq, amma əzaba düçar edəcək işlər gördünüz; Dediniz Allahın mükafatına çatmaq istəyirik, amma

əməlləriniz sizi bu mükafatlardan uzaq saldı; Allahın nemətlərindən yeyir, amma şükr etmirsiniz; Əmr olundu ki, şeytanla düşmən olun. Dildə «düşmənik» dediniz, amma əməldə onunla müxalif olmadınız; Başqalarında eyib axtarıb, öz eyiblərinizə göz .(yumdunuz»(۱

## Sual ۱۸

?Sual ۱۸: Salman Farsi İslama necə gəldi

Cavab: Həzrəti Məhəmməd (s) «Salman bizdəndir» buyurmaqla, Onun hansı iman mərtəbəsində olduğunu ən sadə şəkildə ifadə etmişdir. Bəs İranda doğulub boya-başa çatmış Səlman necə oldu ki, Peyğəmbərin (s) ən yaxın adamlarından birinə ?çevrildi

Hələ gənc ikən, Salman yaşadığı şəhərin hakiminin oğlu ilə dostluq edirdi. Bir gün öz dostu ilə səhraya ova çıxan Salman, İncil oxuyan rahiblə rastlaşdı. Rahib gənclərə İncil haqqında danışıb, Allaha itaətə, günahdan uzaqlığa çağıran təsirli kəlamlar oxudu. Rahib onlara dedi ki, doğru dində olmayanların kəsdikləri heyvanların əti haramdır. Nəhayət, onlar sağollaşıb ayrıldılar. Amma gənclər tez-tez səhraya gedib, rahibin .söylədiyi ilahi kəlamlardan feyz aparardılar

Bir gün hakimin oğlu süfrəyə oturmaqdan imtina edib, süfrədəki yeməklərin haram olduğunu bildirdi. Hakim vəziyyətin nə yerdə olduğunu öyrənib, rahibi öz əyalətindən çıxardı. Salmanla hakimin oğlu rahiblə getmək qərarına gəlsələr də, dostunun .yubandığını görən Salman, yola düşdü

İlk əvvəl rahiblə birgə Mosulda məskunlaşan Salman, bir müddət sonra öz müəllimi ilə .birlikdə Beytül-müqəddəsə yola düşdü



---

.Səfinətül-bəhar», ۱-ci cild, səh. ۴۴۸» [۱۱]-۱

Bir gün Salmanı qəmli görən müəllim onun pərişanlığının səbəbini soruşanda, o, belə dedi: «Bütün yaxşılıqlar keçmiş nəsillərə qismət olub, peyğəmbərlərlə birgə yaşayıblar». .Müəllimi ona təsəlli verib, son peyğəmbərin zühurunun hələ qarşıda olduğunu bildirdi

Beytül-müqəddəsdən Mosula qayıdarkən, gözlənilməz hadisələr səbəbindən müəllimini itirən Salman bir ərəbə əsir düşdü. Ərəb Salmanı Mədinəyə gətirib, qul kimi .satdı

Bir gün Salman Mədinəyə gəlmiş bir şəxsin, özünü peyğəmbər kimi təqdim etdiyini eşitdi. Yubanmadan bu şəxsin olduğu yeri soraqlayan Salman, nəhayət, onu bir məclisdə tapdı. Salmanın son peyğəmbərin nişanələri haqqında kifayət qədər məlumatlı idi. Ətrafında xeyli insan toplanmış şəxsə yaxınlaşıb, bu əlamətləri yoxlamağa fürsət axtardı. Həmin şəxs qəlbi imanla dolu Salman ürəyini oxuyurmuş kimi, onu yaxına çağırdı və libasını çiynindən qaldırıb, ona nə isə göstərdi. Peyğəmbərlik möhrünü öz gözləri ilə görən Salmanda bir zərrə də şəkk qalmadı ki, .qarşısındakı şəxs son peyğəmbərdir

## Sual ۱۹

?Sual ۱۹: Zina etməyə icazə varmı

Cavab: Ayə və hədislərdə zinanın böyük günahlardan olduğuna kifayət qədər dəlil vardır. Ümumiyyətlə, bəşər tarixi boyu bu əməl ən çirkin əməllərdən hesab .olunmuşdur

Əl-minar» təfsirində belə bir rəvayət nəql olunur: «Böyük bir məclisdə cavan bir oğlan» ayağa qalxıb, həzrət Məhəmmədə (s) belə bir sual verdi: «Mənə icazə verərsənmi zina edim?». Məclisdən onun bu sualına etiraz səsləri ucaldı. Amma həzrət Peyğəmbər (s) mülayimliklə onu yaxına çağırıb, qarşısında əyləşdirdi və məhəbbətlə soruşdu: «Əgər bir şəxs sənin anan və ya bacınla zina etmək

istəsə, razı olarsanmı?». Gənc «razı olmaram» dedi. Həzrət sözünü belə sona yetirdi: «Bil .«ki, xalq da onun qızları ilə zina edilməsinə razı deyildir

**Sual ۲۰**

?Sual ۲۰: Yalançı peyğəmbəri necə tanımalı

Cavab: Peyğəmbərlik bir qrup pak insana əta olunmuş böyük ilahi məqamdır. .Peyğəmbərlər bəşəriyyətin doğru yola hidayəti üçün göndərilmiş elçilərdir

Əgər bir şəxs tibb elmindən anlayışı olmadığı halda həkimlik iddiasına düşüb bir neçə insanın həyatına son qoyursa, yalançı peyğəmbər bütün bəşəriyyəti dünya və axirət əzabına sürükləyir. On dörd əsr əvvəl həzrət Məhəmmədin (s) risaləti ilə peyğəmbərlik missiyası başa çatsa da, yalançı peyğəmbərlər bu gün də yağışdan sonra göbələk kimi ?baş qaldırmaqdadırlar. Bəs onları necə tanımalı və necə ifşa etməli

Unutmayaq ki, nə zamansa öz peyğəmbərliyini elan etmiş Musa, İsa, Məhəmməd (s) və sair peyğəmbərləri cəmiyyət sualla qarşılamışdır. Onlardan peyğəmbərliklərinin sübutuna dəlillər istənilmişdir. Musa öz möcüzəli əsası, İsa ölüləri diriltməsi, Həzrəti Məhəmməd (s) Quranın ecazı və şəqqül-qəmər kimi hadisələrlə bütün şübhələri aradan qaldırmışlar. «İsra» surəsinin ۸۸-ci ayəsində buyurulur: «De ki, bütün insanlar və cinlər cəm olaraq bütün qüvvələrini işə salsalar belə, Quran mislində bir kitab gətirə !bilməzlər». Gəlin, peyğəmbərlik fikirinə düşənlərdən möcüzə istəyək

**Sual ۲۱**

?Sual ۲۱: İnsan nə üçün ölümdən qorxur

Cavab: Əksər insanların ölümdən qorxduğu sirr deyildir. Ayə və hədislərdən məlum :olur ki, bu qorxunun iki əsas səbəbi vardır

İkinci qrup insanlar, ölümdən sonrakı həyatın varlığına inansalar da, yol verdikləri .٢ cinayət və günahlar ucbatından ölümdən, əməllərin hesab anından qorxuya düşürlər. Bu qəbil insanlar, məhz cəza gününün sıxıntısından xoflanaraq, ölümdən qaçmağa çalışırlar. «Bəqərə» surəsinin ٩٥-ci ayəsində oxuyuruq: «Onlar öz əməllərini bildiklərinə .«görə, ölümü əsla istəməzlər

Amma peyğəmbərlərə və ilahi kitablara iman gətirib, ölümdən sonrakı həyata inananlar, ibadət edib xeyir işlərə çalışanlar, ölümü dünya çətinliklərindən qurtuluş .kimi qəbul edərlər

Din və vətən uğrunda canından keçən insanlar, əbədi həyatın varlığına inanmış, böyük .amallar yolunda canlarını əsirgəməmişlər

**Sual ٢٢**

?Sual ٢٢: Harut və Marut kimdir

Cavab: Babil məmləkətində olmuş bu iki mələk haqqında saysız-hesabsız əfsanələr uydurulmuşdur. Hətta təfsirçilərdən də bəziləri, uyğun gəlməyən fikirlər söyləmişlər. Onlar Harut və Marutun yerə enməsi səbəbi barədə belə deyirlər: «Allah onları yerə endirdi bilsinlər ki, onlar da insanların yerinə olsaydılar, günaha yol verərdilər. Onlar da .«yerə endikdən sonra böyük günahlara başladılar

Qurani-kərimdə buyurulur: «Şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanları xalqa öyrədərək, kafir oldular. Halbuki, o iki mələk

.(biz imtahanıq, sən gəl kafir olma» deməmiş, kimsəni öyrətmirdi»(۱)»

Məcməül-bəyan»da bu ayənin təfsirində oxuyuruq: «Babil ölkəsində sehr və cadu öz» zirvəsinə çatmışdı. Bu, xalqı çox narahat edirdi. Allah-təala insan surətində iki mələk .göndərdi ki, xalqa sehr və cadunun təsirsizləşdirilməsi yollarını öyrətsinlər

Mələklər məcbur oldular ki, sehr-caduya qarşı mübarizə aparacaq insanlara onun yollarını da öyrətsinlər. Həmin adamlardan bir dəstəsi öyrəndiklərindən sui-istifadə edərək, sehrbazlara qoşuldular. Hansı ki, mələklər onlara xəbərdarlıq etmişdilər ki, bu .«biliklərdən pis məqsədlə istifadə etmək küfrdür

### Sual ۲۳

?Sual ۲۳: Nübüvvət, risalət və imamət bir-birindən nə ilə fərqlənir

.Cavab: Allah tərəfindən əmr almış üç təbəqə mövcuddur: nəbilər, rəsullar və imamlar

Nübüvvət məqamına çatmış şəxs (nəbi), Allahdan vəhy qəbul edir və vəhy .göstərişlərinə ehtiyacı olanları məlumatlandırır

Risalət məqamındakı şəxs isə təbliğ edir, ilahi hökmləri cəmiyyətdə yayır və .düşüncələrdə inqilab etmək üçün çalışır

İmamət məqamına seçilən şəxs isə ilahi hökmlər əsasında hökumət təşkil edərək, xalqa rəhbərlik edir. Əgər hökumət təşkil etməyə qüvvəsi çatmasa, imkan daxilində .ilahi buyruqların yerinə yetirilməsinə səy göstərir

İslam Peyğəmbəri (s) də daxil olmaqla, əksər peyğəmbərlər hər üç məqama malik olmuşlar: həm vəhy almış, həm bu vəhyi təbliğ etmiş, həm də ilahi hökmlərin



---

.Bəqərə» surəsi, ayə ۱۰۲» [۱۲] -۱

.icrası üçün çalışmışlar. İmam həm mənəvi rəhbər, həm təlimçi, həm də hakimdir

Bütün imtahanlardan çıxmış İbrahim peyğəmbər (ə) imamlıq məqamı ilə .mükafatlandırılır. İmam, öz şəfəqləri ilə təbiət aləmini canlandıran günəşə bənzəyir

Qeyd edək ki, nübüvvət və risalət məqamlı bəzi peyğəmbərlərin imamət məqamı .olmamışdır

## Sual ۲۴

?Sual ۲۴: Allahı zikr etmək nə deməkdir

Cavab: «Zikr» ərəbcədən tərcümədə «yada salmaq» deməkdir. Allah-təala Qur´anda .(buyurur: «Məni yada salın ki, mən də sizi yada salım»(۱

Sözsüz ki, Allahı yada salmaq, təkcə dilə aid deyildir. Dil qəlbin tərcüməçisidir. Allahın zikri dedikdə, insanın Onu bütün varlığı ilə yada salması nəzərdə tutulur. Bu elə bir .zikrdir ki, insanı günahdan uzaqlaşdırır, onu itaətə sövq edir

Həzrət Peyğəmbər (s) buyurur: «Bu ümmətdə üç işi tam yerinə yetirməyə qüvvə çatmır: var-dövlətdə din qardaşı ilə bərabərlik, ədalətli mühakimə ilə xalqın hüququna riayət, Allahın ardıcıl zikri. Zikr «sübhanallah», «əlhəmdu lillah», «la ilahə illəllah», «əllahu əkbər» deyil. Zikr odur ki, qarşıya haram iş çıxdıqda ,Allahı yada salıb, bu işdən uzaq .(olasan»(۲

Amma unutmaq olmaz ki, öz misilsiz əzəmətinə baxmayaraq, Allah-təala «Məni yada salın ki, mən də sizi yada salım» buyurur. İnsanın bu məhdud və kiçik dünyada Allahı xatırlaması, onun hüdudsuz və əbədi axirət aləmində Allah tərəfindən xatırlanması ilə .nəticələnir



---

.Bəqərə» surəsi, ayə ۱۵۲» [۱۳]-۱

.Nurus-səqəleyn», ۱-ci cild, səh. ۱۴۰» [۱۴]-۲

## Sual ٢۵

?Sual ٢۵: Ühüd döyüşündə müsəlmanlar nə üçün məğlub oldular

Cavab: İslam tarixindən məlumdur ki, Bədr döyüşündə müsəlmanlara məğlub olan Qüreyş tayfasından ٧٠ nəfər öldürüldü. Əbu Süfyan qəzəbləri soyumasın, deyə .qadınları ağlamağa belə qoymadı. Qüreyş «intiqam» deyə fəryad çəkirdi

Həzrət Peyğəmbərin (s) əmisi Abbasdan Qüreyşin növbəti dəfə Mədinəyə hücumu barədə məktub aldı. Peyğəmbər (s) Mədinə əhlini toplayıb, onlarla məsləhətləşmə apardı. Müsəlmanlardan bir qrupu düşmən qoşununun gücünü nəzərə alaraq, şəhərdən çölə çıxmamağı, Qüreyşlə Mədinənin dar küçələrində döyüşməyi təklif etdilər. Amma Səd ibni Məaz da daxil olmaqla, döyüşgən cavanlar bunu özlərinə sığışdırmayıb, Mədinədən çıxmağı israrla təkid etdilər. Həzrət Peyğəmbər (s) .Mədinədən çıxmağa meyilli olmasa da, çoxluğun təklifini qəbul etdi

Döyüş başladı və müsəlmanlar bir güclü həmlə ilə düşmən qoşununu geri oturtdular. Qüreyşin tam məğlub olduğunu zənn edən müsəlmanlar, yanılmışdılar. Müsəlmanların arxayınlaşmasından istifadə edən düşmən, əks hücuma keçərək, Ühüd döyüşündə .qələbə qazandı

:Bu döyüşdə müsəlmanların məğlubiyyətinin dörd əsas səbəbi vardır

İslamı təzə qəbul edənlərdən bir hissəsi Allahın qeybi yardımlarından . ١ .arxayınlaşaraq, lazımı döyüş hazırlığı görməmişdilər

Həzrət Peyğəmbərin (s), oxatanların səngərdə qalmasına dair verdiyi əmrə . ٢ .itaətsizlik göstərildi

Müsəlmanlardan bir hissəsi düşməni təqib etmək əvəzinə, silahı yerə qoyub, . ٣ .qənimət ardınca qaçdı

Əvvəlki Bədr döyüşündəki qələbədən arxayınlaşan müsəlmanlar, Ühüd döyüşündə .۴ .düşmənin gücünü düzgün qiymətləndirməmişdilər

**Sual ۲۶**

?Sual ۲۶: Günah olan məclisdə oturmaq olarmı

Cavab: Ənam surəsinin ۶۸-ci ayəsində buyurulur: «Ayələrimizə istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir. Əgər şeytan bunu sənə unutdursa, xatırlayandan sonra o zalım tayfa ilə oturma». Uyğun əmrə itaət etməyənlərə xəbərdarlıq olunur: «Belə məclislərdə iştirak etsəniz, siz də onların tayı .(olacaq, onların aqibəti ilə rastlaşacaqsınız»(۱

:Ayə və hədislərdən aşağıdakı nəticələr çıxır

;Günah məclisində iştirak, günahda iştirak kimidir .۱

Belə məclisdə iştirak edən şəxs, ya günahın qarşısını almalı, ya da həmin məclisi tərk .۲ ;etməlidir

;Belə məclislərdə sakit oturanın cəzası, günahkarların cəzası qədərdir .۳

;Günaha yol verilməyən məclislərdə kafirlərlə oturmaq olar .۴

Günahkarlarla mehriban münasibət nifaq nişanəsidir. Çünki həqiqi müsəlman, ilahi .۵ .hədlərin pozulduğu mühitdə rahat dayana bilməz

**Sual ۲۷**

?Sual ۲۷: Təvəssül nədir

Cavab: «Təvəssül» ərəbcədən tərcümədə «müəyyən vasitə ilə məqsədə yaxınlaşmaq istəyi» mənasını verir. «Maidə» surəsinin ۳۵-ci ayəsində buyurulur: «Ey iman gətirənlər, .(«Allahdan qorxun. Ona yaxınlaşmaq üçün vasitə axtarın» («vəbtəğu iləyhil-vəsilə

Uyğun ayədəki «vəsilə» sözünün mənası çox genişdir. İnsanı Allaha yaxınlaşdıran bütün şeylər ... Allaha və Onun Rəsuluna (s) iman, cihad, namaz, zəkat, oruc, həcc, sədəqə və .sair xeyir işlər bu yaxınlıq üçün vəsilədir

Qeyd etdik ki, təvəssül vasitə axtarmaqdır. Peyğəmbərlərin, imamların, saleh bəndələrin şəfaəti də təvəssülə aiddir. Hətta Allahı peyğəmbərlər, imamlar və .salehlərin məqamına and vermək, bu geniş mənaya daxildir

Peyğəmbər və imamlara təvəssül, yəni onlar vasitəsi ilə Allaha yaxınlaşmaq o demək deyildir ki, insan insana ibadət edir, şirkə düçar olur. Yuxarıda qeyd olunduğu kimi, təvəssül nəinki Qurana zidd deyil, hətta ayələrlə təsdiqlənir. «Nisa» surəsinin ۶۴-cü ayəsində oxuyuruq: «(Ya peyğəmbər) Onlar özlərinə zülm etdikləri zaman, dərhal sənin yanına gəlib Allahdan bağışlanmaq diləsəydilər və peyğəmbər də onlar üçün əfv .«istəsəydi, əlbətdə, Allahın tövbələri qəbul edən və mərhəmətli olduğunu bilərdilər

### **Sual ۲۸**

?Sual ۲۸: Çoxluq həmişə haqlıdırmı

Cavab: Bəzən eşidirik: əgər spirtli içki pisdirsə, nə üçün dünyada böyük əksəriyyət ?ondan istifadə edir

Maidə» surəsinin ۱۰۰-cü ayəsində Allah-təala buyurur: «Ya peyğəmbər, de ki, murdar» .«şeyin çoxluğu səni heyrətə gətirsə belə, murdarla pak bir ola bilməz

Bəşər tarixi boyu mübahisəsiz qəbul olunan məsələlərdən biri də, kəmiyyət və keyfiyyət anlayışlarının bir-birindən asılı olmamasıdır. Bununla belə, cahil insanlar öz batil fikirini sübuta yetirmək üçün çoxluğu dəlil gətirir. Bu nadan dəstənin fikirincə, əgər çoxluq spirtli içki içərsə, demək spirtli içkilər pis deyil və sən də içə bilərsən əgər

əksəriyyət faizlə pul götürüb, faizlə pul verirsə, demək sələm pis deyil və sən də sələmçi ola bilərsən və s. Hansı ki, çoxluğun rəyinə tabe olub, həqiqətdən yan keçmək .münafiqlərə məxsus sifətdir

Kor-koranə çoxluğa tabeçilik, batilə haqq donu geyindirir və həqiqət unudulur. Bəşəriyyətin bədbəxtçiliklərinin əsas səbəblərindən biri də, məhz bu düşüncə tərzidir. «Ənam» surəsinin ۱۱۶-cı ayəsində oxuyuruq: «Əgər sən yer üzündə olanların əksəriyyətinə itaət etsən, onlar səni Allahın yolundan azdırarlar. Onlar ancaq zənnə .«uyar və ancaq yalan danışarlar

**Sual ۲۹**

?Sual ۲۹: İnsanları haqqa dəvət edib, batildən çəkindirmək vacibdirmi

Cavab: «Maidə» surəsinin ۱۰۵-ci ayəsində oxuyuruq: «Ey iman gətirənlər, nəfsinizi .«qoruyun. Siz doğru yolda olsanız, yoldan azanlar sizə heç bir zərər yetirməzlər

İslamda hər bir müsəlmana vacib buyurulmuş on əməl sırasında əmr be məruf (doğru yola əmr) və nəhy əz münkər (azğınlıqı qadağan etmə) də vardır. Lakin bəziləri yanılaraq, yuxarıda zikr edilmiş ayədən belə nəticə çıxarırlar ki, hərə öz həyat tərzini .müəyyən etməli və yolundan azanlara mane olmamalıdır

Rəvayət olunur ki, həzrət Peyğəmbərin (s) və onun yaxınlarının iştirak etdiyi bir məclisdə «əmr be məruf» və «nəhy əz münkər» mövzusunda söhbət gedirdi. Gənc müsəlmanlardan biri söhbətə qarışaraq, yuxarıdakı ayəni misal gətirərək, «doğru yola çağırışa hacət qalırmı»,-deyə sual verir. Həzrət Peyğəmbər (s) buyurdu: «Doğru yola əmr edin və bu yoldan azanların qarşısını alın. Amma elə bir zaman gəlsə ki, insanlar dünyanı üstün tutsalar, paxıllıq və nəfs onlara hakim olsa, hər kəs yalnız öz

.(fikirini bəyənsə, bu cahillərdən uzaqlaşıb, özünüzlə məşğul olun»(۱

Deməmk, uyğun ayədəki göstəriş, yalnız müəyyən dövrə aiddir. Din, vətən, millət sevgisini anlayan insan bilir ki, ətrafdakı insanlara laqeyidlik cəmiyyəti uçuruma .sürükləyir

## Sual ۳۰

?Sual ۳۰: Müsəmma əcəl nədir

Cavab: «Ənam» surəsinin ۲-ci ayəsində buyurulur: «Odur sizi palçıqdan yaradan, sonra .«isə əcəli müəyyən edən. Allahın yanında Müsəmma ... məlum bir əcəl də vardır

Ayədən məlum olur ki, insan üçün iki əcəl, iki ölüm vardır: müsəmma ... məlum əcəl və sadəcə əcəl. Başqa ayələrdən, eləcə də Əhli-beyt (ə) hədislərindən faydalanan .təfsirçilər bu qənaətdədirlər ki, müsəmma əcəl təbii ölüm, əcəl isə qeyri-təbii ölümdür

Öz təbii etibarı ilə bir çox mövcudlar uzun müddət yaşaya biləcəyi halda, müəyyən bir səbəb üzündən qəfil ölümlə rastlaşırlar. Beləcə, qəfil ölüm təbii ölümü qabaqlayır. İnsan da belədir. Əgər ona verilmiş ömrü qısaldacaq maneələr ortaya çıxmasa, təbii ölümədək yaşaya bilər. Məsələn, bir neft lampasının iyirmi saatlıq nefti varsa, əgər bir maneə olmasa, o bu iyirmi saatı yanmağında davam edəcək. Onun iyirmi saatdan sonra sönməsi təbii ölümün bir misalıdır. Amma qəfil əsən bir külək bu lampanı bircə .saatdan sonra da söndürə bilər

Qeyri-təbii ölümün vaxtını qohum-əqrabanı tez-tez yoxlamaqla gecikdirmək olar. :Amma təbii ölümün vaxtını dəyişmək qeyri-mümkündür. Qurani-kərimdə buyurulur



---

.Nurus-səqəleyn», ۱-ci cild, səh. ۶۸۴» [۱۶] -۱

Hər bir ümmətin əcəl vaxtı vardır. Onların əcəli gəlib çatdıqda, bircə saat belə nə» .(yubanar, nə də tezləşər»(١

**Sual ٣١**

?Sual ٣١: Peyğəmbərliyə nə üçün mələk seçilmədi

Cavab: Həzrət Peyğəmbər (s) və onun gətirdiyi ayinlərə müxalif olanlar, öz çirkin məqsədlərinə çatmaq üçün min bir bəhanə gətirir, bütün vasitələrə əl atırdılar. Bu bəhanələrdən biri də, peyğəmbər olaraq mələk yox, insanın seçilməsindən doğan narazılıq idi. Hansı ki, həzrət Məhəmmədin (s) peyğəmbərliyinə kifayət qədər dəlil var idi. İkinci bir tərəfdən, belə bir etiraz təkcə həzrət Məhəmmədə (s) qarşı yox, bütün .peyğəmbərlərə qarşı yönəlmişdi və olduqca yersiz görünürdü

Bəs Qurani-kərimdə bu barədə nə deyilir? «Ənam» surəsinin ٨-ci ayəsində Allah-təala buyurur: «Əgər biz elə bir mələk göndərsəydik, iş bitmiş olar və iman gətirməyənlərə .«bir an belə möhlət verilməzdi

Maraqlıdır, nə üçün möhlət verilməzdi? Cavab çox sadədir: Allah-təala insanı əzaba düçar etməzdən əvvəl, ona xəbərdarlıq edir. Xəbərdarlıq həm söz, həm də gözlə ola bilər. Məsələn, bir insana «ovcumda qızıl olduğuna inanmasan, səni cəzalandıracağam» deyirsən. Bu sözlə xəbərdarlıqdır. Gözlə xəbərdarlıq odur ki, ovcundakı qızılın bir tərəfini o şəxsə göstərəsən. Sözlə xəbərdarlığa məhəl qoymayan insana düşünmək üçün möhlət vermək olar. Amma gözü ilə gördükdən sonra inanmayan şəxsə möhlət vermək üçün heç bir əsas yoxdur. Peyğəmbər olaraq mələk göndərilməsi, qeybin aşkarlanması və gözlə görünən son xəbərdarlıqdır. Allah-təala isə, insanı əql mülkü ilə .mükafatlandıraraq, onu üstün etmişdir



---

.Əraf» surəsi, ayə ٣۴» [١٧] -١

Heyvanlar da gördüyünü hiss edir, duyur. İman isə, zahir gözü ilə gördüyünə yox, bəsirət gözü ilə gördüyünə inanmaqdır. Növbəti ayədə oxuyuruq: «Əgər biz onu mələk etsəydik, yenə də insan qiyafəsində göndərər və onları bir daha şübhəyə salardıq».

**Sual ٣٢**

Sual ٣٢: İlk müsəlman kimdir?

Cavab: Qurani-kərimin «Ənam» surəsinin ١۶٣-cü ayəsində buyurulur: «(Ya Məhəmməd, de ki) onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam».

Ayədən açıq-aşkar məlum olur ki, ilk müsəlman həzrət Məhəmməddir (s). Amma «Yunis» surəsinin ٧٢-ci ayəsində Nuh peyğəmbərin, «Bəqərə» surəsinin ١٢٨-ci ayəsində İbrahim peyğəmbərin, «Yusif» surəsinin ١٠١-ci ayəsində isə, Yusif peyğəmbərin müsəlmanlığı haqqında məlumat verilir.

Bəzi təfsirçilərin fikirincə, hələ ruhlar aləmində Allah-təalanın dəvətinə ilk müsbət cavab verən insan, həzrət Məhəmməd (s) olduğu üçün ilk müsəlman da o hesab edilməlidir.

Amma başqa bir fikir də mövcuddur. «Müsəlman» sözünün lüğəti mənası «təslim olan» deməkdir. Bu baxımdan Adəm peyğəmbərdən başlayaraq, Allah əmrinə bütün təslim olanlar müsəlmandırlar.

«Müsəlman» sözünün ikinci mənası, İslam dinini qəbul edən şəxslərə şamil olunur və bu baxımdan ilk müsəlman həzrət Məhəmməd (s) olmuşdur.

**Sual ٣٣**

Sual ٣٣: Adəm (ə) günahkardırmı?

Cavab: Yəhudilərin və məsihilərin müqəddəs kitablarına əsasən, Adəm (ə) çox ağır günaha yol vermişdir.

.Lakin İslam mənbələrində Adəmin günaha yol verdiyi qətiyyətlə inkar olunur

Bilirik ki, Adəm ilahi peyğəmbərlərdəndir. Quran ayələrinə əsasən, ilahi peyğəmbərlər günah edə bilməz. Bəzilərinin günah adlandırdığı müəyyən əməllər isə, mütləq günah deyil, «tərki-əvla»dır. «Əvlanın» lüğəti mənası, «ən üstün» deməkdir. «Tərki-əvla» ən üstün, ən yaxşı əməlin tərk edilməsidir. Məsələn, çox varlı bir adam kasıb qonşusuna böyük köməklər göstərə biləcəyi halda, cüzi bir yardım göstərir. Bu varlığın haqqında elə ittihamlar irəli sürülür ki, guya həmin şəxs günaha yol verib. Əslində isə, heç bir .günah baş verməyib. Sadəcə, yaxşı bir işi tərk edib

İlahi dərgaha yaxın insanların əməlləri, onların məqamına görə ölçülür. Adi bir insan üçün günaha hesab olunmayan əməl, övliyalar üçün qüsur sayıla bilər. Ona görə də, .tərki-əvlaya yol vermiş peyğəmbərlər, dərhal cəzalandırılırlar

Adəmin qadağan olunmuş ağaca toxunması günah yox , tərki-əvladır. Bu əmələ görə, adi bir adam heç vaxt cəzalandırılmazdı. Adəm peyğəmbərin cəzalandırılmasının səbəbi, onun yüksək məqamı idi. Allah-təala «bu ağaca yaxınlaşmayın, yoxsa özünüzə .zülm edənlərdən olarsınız» buyuraraq, sadəcə, Adəmə xəbərdarlıq etmişdir

## Sual ۳۴

?Sual ۳۴: Musa (ə) nə üçün tövbə etdi

Cavab: Musa peyğəmbər Bəni-İsrail tayfasının inadkarlığı qarşısında bir çox çətinliklərlə üz-üzə gəlirdi. «Nisa» surəsinin ۱۵۳-cü ayəsində Allah-təala buyurur: «(Ya Məhəmməd) kitab əhli sənin onlara göydən bir kitab endirməyini istəyirlər. Halbuki, onlar Musadan bundan

.«daha böyüyünü istəmiş və «bizə Allahı aşkar göstər» demişdilər

Bəni-İsrailin bu axmaq istəyi qarşısında Musanın Allah-təalaya müraciət etməkdən başqa yolu qalmamışdı. Beləcə, Musa Bəni-İsrailin nümayəndəsi olaraq «Ey Rəbbim, özünü mənə göstər», dedi. Musanın istəyi qarşısında, Allah-təala buyurdu: «Sən məni əsla görə bilməzsən. Lakin dağa bax. Əgər o yerində dura bilsə, sən də məni görə .«bilərsən

Quranda belə buyurulur ki, Allah-təala dağa təcəlli etdi və dağ parça-parça oldu. Musa .huşunu itirdi. Ayılandan sonra isə bu yersiz istəyə görə tövbə etdi

Musa (ə) Bəni-İsrailin istəyini yerinə yetirdiyi halda, nə üçün özü tövbə etməli idi? Təfsirçilərin fikirincə, Musa Bəni-İsrailin nümayəndəsi olaraq onların tərəfindən tövbə .edirdi

### Sual ۳۵

?Sual ۳۵: Nə üçün dünya bir anda yaradılmadı

Cavab: «Əraf» surəsinin ۵۴-cü ayəsində buyurulur: «Həqiqətən, Allah-təala göyləri və yeri altı gündə xəlq etdi». Maraqlıdır ki, görəsən, misilsiz əzəmət sahibi olan Rəbbimiz ?nə üçün dünyanı bir anda yaratmadı

Təfsirçilər bu fikirdədirlər ki, hər hansı bir işin bir anda həyata keçməməsi, həmin işin hikməti haqqında düşünməyə imkan verir. Məsələn, insanın ana bətnində doqquz ay müddətində mərhələ-mərhələ formalaşması, yaradanın əzəmətini daha da aşkar .göstərir

Allah-təala yeri və göyləri bizim ölçülərlə hər biri neçə milyon il davam etmiş altı dövürdə yaratmışdır. Quranda buyurulan altı gün, bizim iyirmi dörd saatlıq günümüzdən tamam fərqlənir. Bu altı günün hikmətlə dolu olan hər anı, ilahi elmin .əzəmətindən danışır

?Bəs bu altı gündə hansı hadisələr baş verdi

İlk gün, toplu qaz formasında olan dünya öz oxu ətrafında fırlanaraq parçalandı və planetlər yarandı İkinci gün, planetlərdən bəzisi közərmiş, bəzisi isə donmuş halda dayanıqlı vəziyyətə keçdi. Üçüncü gün, günəş sistemi yaranmaqla, yer günəşdən ayrıldı. Dördüncü gün, yer soyudu və həyat üçün şərait yarandı. Beşinci gün, otlar və .ağaclar yaradıldı. Altıncı gün heyvanlar və insan yer üzündə zahir oldu

**Sual ۳۶**

?Sual ۳۶: Əsa əjdahaya çevrilə bilərmi

Cavab: «Əraf» surəsinin ۱۰۷-ci ayəsində oxuyuruq: «Musa əsasını atdı və o, dərhal aşkar .«görünən əjdahaya çevrildi

Musanın əsasının əjdahaya çevrilməsi hadisəsini iki baxımdan izah etmək olar: Əvvəla, qeyd edək ki, bütün peyğəmbərlər möcüzə ilə gəldikləri kimi, Musa (ə) da möcüzə ilə gəlmişdi və bu möcüzələrdən biri də, əsa idi. Bu hadisənin adi insanlara təəccüblü görünməsi, möcüzənin mahiyyətini təşkil edir. Əgər bir hadisə təəccüb doğurmursa, onu möcüzə hesab etmək olmaz. Musa öz peyğəmbərliyini möcüzə ilə sübuta yetirməli .idi. Bütün materiya qanunlarının tabe olduğu Allahın iradəsi ilə bu möcüzə baş tutdu

İkincisi, unutmaq olmaz ki, təbiət aləmindəki bütün heyvanlar da, digər canlılar kimi torpaqdan yaranmışdır. Əgər həm əjdaha, həm də əsanın düzəldildiyi ağac torpaqdan yaranmışdırsa, onların bir-birinə çevrilməsində elmlə uzlaşmayan heç bir şey yoxdur. ,Təəccüb doğuran isə

keçid prosesidir. Əgər bir damla nütfə doqquz ay deyil, bir anda insana çevrilsəydi, bu da təəccüblü olardı. Əslində, əsadan əjdaha yaranmasına nisbətən nütfədən insanın yaranması, daha da dərin bir prosesdir. Birinci hadisəni daha ecazkar göstərən .prosesin mərhələ-mərhələ yox, bir anda həyata keçməsidir

## Sual ۳۷

?Sual ۳۷: «Mənzələt» hədisində nə deyilir

Cavab: Həzrət Peyğəmbərin (ə) buyuruqları arasında adıyla tanınan məşhur hədislərdən biri də, «Mənzələt» hədisidir. Bu hədis həm şiə, həm də sünnət əhli alimləri tərəfindən nəql olunmuşdur. Ən məşhur sünni mənbələri «Səhihi-Buxari», «Səhihi-.Müslim»də adı çəkilən hədislə rastlaşırıq

Hədisdə buyurulur: «Peyğəmbər (s) Təbuka yola düşərkən, Əlini (ə) öz yerində qoydu. Əli (ə) ərz etdi: «Məni uşaqlar və qadınlar arasında qoyursan?». Həzrət peyğəmbər buyurdu: «Razı deyilsənmi ki, Harun Musa üçün necə idisə, sən də mənim üçün elə .(olasan?!»(۱)

Hədislərdə qeyd olunur ki, bir gün Müaviyə Sədə dedi: «Nə üçün Əliyə lənət oxumursan?». Səd dedi: «Həzrət peyğəmbərin Əli (ə) haqqında buyurduğu üç şey yadıma düşür və lənət deyə bilmirəm». Sonra Səd uyğun mənzələt hədisində həzrət .Peyğəmbərin (s) buyurduğu cümləni və daha başqa iki kəlamı zikr edir

Başqa bir rəvayətdə nəql olunur ki, Ömər ibni Xəttab bir kişinin Əliyə (ə) lənət oxuduğunu görür. Kişiyə deyir: «Zənnimcə, sən münafiqsən. Çünki həzrət Peyğəmbər (s) Əlinin haqqında belə buyurub: «Harun Musa üçün hansı məqamdaydısa, Əli də .(mənim üçün həmin məqamdadır»(۲)



---

.Səhihi-Buxari», ۶-cı cild, səh.۳» [۱۸] -۱

.Tarixe-Bağdad», ۷-ci cild, səh. ۴۵۲» [۱۹] -۲

## Sual ۳۸

?Sual ۳۸: İnsan heyvana çevrilə bilərmi

Cavab: «Əraf» surəsinin ۱۶۶-cı ayəsində buyurulur: «Qadağan olunmuş işə saymazyana münasibət bəslədikləri vaxt, onlara əmr etdik: «Zəlil meymunlara dönün!».

Müxtəlif ayələrdən məlum olur ki, yolunu azmış tüğyançı tayfaları Allah-təala müxtəlif cür cəzalandırır. Yuxarıdakı ayə, bir qrup azğın insanın cəza olaraq heyvana döndərildiyini xəbər verir. Burada insanın ruhən, yoxsa cismən heyvanlaşmasından söhbət gedir. Elmi nöqteyi-nəzərdən insanın cismən heyvana dönməsi qeyri-mümkündür. Həyat şəraitinin dəyişməsi təsiri altında, orqanizmdə yeni bioloji əlamətlər yarana bilər. Mutasiya adlanan bu dəyişmə, orqanizmi qismən dəyişə bilər. Demək, insanın heyvana çevrilməsi, yalnız möcüzə yolu ilə mümkündür.

Amma təfsirçilərin kiçik bir hissəsi bu fikirdədirlər ki, uyğun ayədə söhbət ruhən heyvanlaşmadan gedir. Onlarla razılaşmayan əksər təfsirçilər, belə bir hadisənin təkamül qanununa zidd olduğunu aşkar edirlər. Onlar bildirirlər ki, təkamül qanunu, təkamül prosesini keçən orqanizmə aiddir. Hansı ki, həyatda istisnalar vardır. Məsələn, yaşıdları inkişafda olan bir yeniyetmə, hansısa bir xəstəlik ucbatından cılızlaşa bilər.

Rəvayətlərdən aydın olur ki, həmin heyvana döndərilmiş insanlar, yalnız bir neçə gün yaşaya bildilər. Əgər nəzərə alsaq ki, təkamül prosesinə uyğun gəlməyən bütün hadisələr davamsız olur (məsələn, iki başlı insan və heyvanlar çox az yaşayır), demək qəzəbə düçar olmuş həmin insanlar cismən meymuna döndərilmişlər.

səh:۳۳

## Sual ٣٩

?Sual ٣٩: Zərr aləmi nədir

Cavab: Müxtəlif İslam mənbələrində zərr aləmi haqqında məlumat verən kifayət qədər rəvayət vardır. Lakin biz yalnız bir Quran ayəsi ətrafında danışacağıq. «Əraf» surəsinin ١٧٢-ci ayəsində buyurulur: «Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən övladlarını çıxarıb, onları özlərinə şahid tutaraq, soruşmuşdu: «Mən sizin .«?Rəbbiniz deyilməmmi

Övladlar» kimi tərcümə olunmuş «zürriyyət» kəlməsinin «zərr» kökündən alındığı» bildirilir. Ayədə haqqında danışılan hadisə harada baş verir? Mötəbər hədislərə .əsaslanan əksər İslam təfsirçiləri, bu hadisənin zərr aləmində baş verdiyini yazırlar

Rəvayətə görə, Adəm xəlq edilən zaman onun son nəfərədək bütün övladları belindən zərrələr şəklində xarici oldu. Əql və şüura malik olan bu zərrələrin eşitmə və danışma gücü var idi. Onlar «mən sizin Rəbbiniz deyiləmmi» sualına «bəli, Rəbbimizsən»,-deyə cavab verdilər. Bu sorğu-sualda məqsəd nə idi? Ayələrdən aydın olur ki, bu sorğu-sualla Allah-təala öz xəbərdarlığını sona yetirirdi. Başqa sözlə, belə bir xəbərdarlıqdan .sonra qiyamət günü kimsə «biz bundan xəbərsiz idik» deyə bilməyəcəkdi

.Uyğun ayə insanda Allaha etiqadın fitri olduğunu bir daha təsdiq edir

## Sual ۴٠

?Sual ۴٠: Qiyamət nə zaman baş verəcək

Cavab: Rəvayətə görə, Qüreyş tayfasından bir neçə nəfər qonşu əyalətdəki yəhudi alimlərlə görüşüb, həzrət Məhəmmədi (s) susdurası suallar hazırlayırdılar. Bu suallardan biri də, qiyamətin nə zaman bərpa olacağı idi. Onlar həzrətin hüzuruna gəlib bu sualı verəndə, ayə nazil

oldu: «Səndən qiyamət haqqında soruşurlar ki, nə vaxt qopacaq? De ki, o ancaq Rəbbimə məlumdur»(١).

Belə bir sual ortaya çıxır ki, bu hadisədən hətta peyğəmbərlərin xəbərsiz qalmasının səbəbi nədir?

Təfsirçilər belə qeyd edirlər ki, əgər qiyamət saatı məlum olsaydı, kimi uzaq görüb arxayınlaşar, kimi də yaxın görüb təsirlənərdi. Bu hadisənin bütün insanlara hər zaman təsirli qalması üçün onun vaxtının qeyri-müəyyən qalması zəruri idi.

Bütün planetlərin orbitindən çıxıb parçalanacağı, günəşin və ulduzların sönəcəyi, o ağır intizarı insanı, heyvani hisslərdən uzaqlaşdırır, onu böyük sorğu haqqında düşünməyə sövq edir. «Qiyamət» surəsində buyurulur: «Gözlərin heyrətdən bərələcəyi, ay tutulacağı, günəşlə ay birləşəcəyi zaman ... məhz o gün insan «qaçıb qurtarmağa yer haradadır», soruşacaq. Xeyir, heç bir sığınacaq olmayacaq. O gün duracaq yer, ancaq Allahın huzurudur!».

**Sual ٤١**

Sual ٤١: Peyğəmbər (s) qeyb aləmindən xəbərdar idimi?

Cavab: Məhdud mütaliəli bir qism insan bəzən bir ayəni oxumaqla nəticə çıxarır. Belə ayələrdən biri də, «Əraf» surəsinin ١٨٨-ci ayəsidir. Ayədə deyilir: «Əgər qeybi bilsəydin, sözsüz ki, daha çox xeyir tədarük edərdin və mənə pislik də toxunmazdı». Bu ayə həzrət Məhəmmədin (s) dilindən buyurulur. Amma ayədən bu nəticə çıxmır ki,peyğəmbər qeyb aləmindən tamamilə xəbərsiz idi. Sadəcə olaraq, peyğəmbərin bu sahədəki biliyi məhdud idi. O, bu barədə Allah-təalanın öyrətdiyi qədər bilirdi. «Cin»surəsinin ٢۶, ٢٧-ci ayələrində oxuyuruq: «Qeybi bilən



---

١- [٢٠] «Əraf» surəsi, ayə ١٨٧.

ancaq Allahdır və öz qeybini kimsəyə əyan etməz bəyənib seçdiyi peyğəmbərdən başqa!». Peyğəmbərlər həm maddi, həm də mənəvi cəhətdən cəmiyyətə rəhbərlik etməyə vəzifəli olduqlarından, onların bir sıra biliklərə ehtiyacı labüddür. Bu sahədə qeyb aləmindən biliyə nə qədər ehtiyacları vardırsa, o qədər də bilirlər. Qeyb aləmindən məlumatı olmayan şəxs, öz dövrünün rəngini alır və onun bilikləri başqa bir zaman və şərait üçün yetərsiz olur. Buyuruqları dünya həyatının sonunadək eyni təsirdə qalan həzrət Məhəmməd (s), heç şübhəsiz, qeyb aləmindən xəbərdar idi. Dünyəvi rəhbərlərin isə, yalnız öz dövrü və öz şəraitində təsirli olduğu göz .qabağındadır

## Sual ۴۲

?Sual ۴۲: Quran oxunan zaman susub, onu dinləmək vacibdirmi

Cavab: Bu barədə Quranda buyurulur: «Quran oxunan zaman, onu dinləyin və susun ki, .(bəlkə rəhm olunasınız»(۱

İbn Əbbas nəql edir ki, ilk əvvəllər müsəlmanlar namaz zamanı söhbət edər, bir-birlərinə sual verərdilər. Yuxarıdakı ayə nazil olduqdan sonra namaz zamanı əlavə .danışıqlar qadağan edildi

Bəs başqa vaxtlar necə, Quran oxunarkən danışmaq olarmı? Rəvayət olunur ki, imam Sadiq (ə) buyurmuşdur: «İstər namaz vaxtı, istərsə də başqa vaxtlar Quran oxunduğunu eşidərkən susub, onu dinləmək lazımdır». Hətta, bəzi hədislərə əsasən, Quran oxunduğunu eşidən pişnamaz yaxşı olar ki, ayə qurtaranadək susub, onu .dinləsin



---

.Əraf» surəsi, ayə ۲۰۴» [۲۱] -۱

Yuxarıda deyilənlərdən aydın olur ki, Quran oxunduğunu eşidən zaman, susmaq çox bəyənilmiş bir işdir. Bununla belə susmaq, vacib deyildir. İslami mənbələrdə belə bir mülahizə də vardır ki, cəmiyyət namazında iqtida edənlərin namazın birinci və ikinci rəkətlərində qiraət zamanı sakit dayanması uyğun ayədəki göstərişə əsaslanır. Amma bu halda da, susmaq vacib deyildir (İqtida edən şəxs astadan zikr edə bilər).

## Sual ۴۳

Sual ۴۳: İmanlı insanda hansı xüsusiyyətlər olmalıdır?

Cavab: Quran ayələri və Əhli-beyt hədislərində möminlərə məxsus bir çox sifətlər sadalanır. Biz yalnız «Ənfal» surəsində qeyd edilmiş sifətlərdən danışacağıq: «Möminlər yalnız o kəslərdir ki, Allahın adı çəkiləndə ürəkləri qorxudan titrəyər».

Həqiqi möminlərdə üç mənəvi və iki əməli keyfiyyət olur. Üç mənəvi xüsusiyyət məsuliyyət hissi, imanın təkamülü və təvəkkülüdür. Deməк, mömin insan Allah qarşısında məsuliyyət hiss edir və onun buyurduğu vəzifələrdə səhlənkarlıq göstərmir.

Möminlərin ikinci mənəvi xüsusiyyəti odur ki, Allahın ayələri oxunduğu zaman imanları artar.

Təkamül bütün dirilərə məxsus olan xüsusiyyətdir. Əgər insanın qəlbində iman ölməmişsə, o inkişaf etməlidir. Diri iman isə, yalnız həqiqi möminlərin qəlbində olur.

Möminlərə məxsus üçüncü sifət, onların yalnız Allaha təvəkkül etməsidir. Onların düşüncələri o qədər uca və genişdir ki, zəif təbiətli insan nəslinə güvənməzlər.

Möminlərin əməli xüsusiyyətləri haqqında belə buyurulur: «Namaz qılar və verdiyimiz ruzidən sərf edərlər». Aydın olur ki, həqiqi möminlərin həm Allah, həm

!də cəmiyyət qarşısında əməli vəzifələri vardır: ibadət və xalqa yardım

## Sual ۴۴

?Sual ۴۴: Kafirlərlə ilk silahlı vuruş hansıdır

Cavab: Müsəlmanların kafirlərlə ilk silahlı vuruşu Bədr döyüşüdür. Əbu Süfyan qırx nəfərlik heyət və əlli min dinarlıq mal ilə Şamdan qayıdırdı. Həzrət Peyğəmbər (s) düşmənin iqtisadi qüdrətini sındırmaq üçün onun əsas sərmayəsinin toplandığı bu karvanı müsadirə etmək qərarına gəldi. Bu qərarın ikinci əsas səbəbi, məhz bu düşmənin işgəncələrindən Mədinəyə hicrət edən müsəlmanların Məkkədəki itirdikləri .var-dövlətlərinin geri qaytarılması idi

Üç yüz on üç nəfərdən ibarət müsəlman mübarizlər, başda həzrət Peyğəmbər (s) olmaqla, karvanı izlədikləri bir vaxt Qüreyş qoşununun hərəkəti barədə məlumat aldılar. Peyğəmbərin (s) planları, Mədinədəki casuslar tərəfindən Əbu Süfyana çatdırılmışdı. O da öz növbəsində Məkkəyə atlı göndərib, karvana kömək istəmişdi. Əsas var-dövləti karvanda olan məkkəlilər, doqquz yüz əlli döyüşçünü, yeddi yüz dəvə və yüz atlı köməyə göndərmişdi. Qoşuna Əbu Cəhl başçılıq edirdi. Məkkə ilə Mədinə arasındakı Bədr məntəqəsində qoşunlar üzbə-üz gəldi. Fürsətdən istifadə edən Əbu .Süfyan, karvanla birlikdə aradan çıxdı

Döyüşdən əvvəl, həzrət Peyğəmbər (s) düşmənə sülh təklif etdi. Qüreyş başçılarından .sülh istəyənlər olsa da, Əbu Cəhl mane oldu

Beləcə, hicrətin ikinci ilində Bədr məntəqəsində müsəlmanların kafirlərlə ilk silahlı döyüşü baş verdi. Peyğəmbərin (s) əmisi Həmzə və qoşunun ən gənc döyüşçüsü Əli (ə) düşmənə sarsıdıcı zərbələr endirdilər. Döyüş meydanında Qüreyş qoşununa sarı hücum çəkən

qum tufanı, Qüreyşin döyüş ruhiyyəsini tamam sındırmışdı. Həzrət Peyğəmbər (s) əllərini göyə qaldırıb ərz etdi: «Ya Rəbb, əgər bu dəstə qətlə yetirilsə, kimsə sənə .«sitayiş etməyəcək

Nəhayət, döyüş başa çatdı. Müsəlmanlar üç dəfə az qüvvə ilə düşmənin güclü qoşunu .üzərində gözlənilməz qələbə çaldılar

## Sual ۴۵

?Sual ۴۵: Düşmən güclüdürsə, döyüşdən qaçmaq olarmı

:Cavab: Yuxarıdakı suala Quran ayələri belə cavab verir

Ey iman gətirənlər, döyüş meydanında kafirlərlə rastlaşdığınız zaman dönüb» .(qaçmayın»(۱

.(İçərinizdə iyirmi səbirli kişi olsa, min kafirə qalib gələr»(۲»

Allahın düşmənini və öz düşməninizi qorxutmaq üçün kafirələrə qarşı bacardığınız» qədər qüvvə və döyüş atları tədarük edin»(۳). «Allahın izni olmayınca, heç kəsə ölüm .(yoxdur»(۴

Sizin içərinizdən iki dəstə qorxaraq, geri çəkilmək fikirinə düşmüşdü. Hansı ki, Allah» .(onların yardımçısı idi. Möminlər gərək Allaha təvəkkül etsinlər»(۵

Kim belə bir gündə düşmənə arxa çevirib qaçarsa, sözsüz ki, Allahın qəzəbinə...» .(uğramış olar. Onun məskəni cəhənnəmdir»(۶

səh:۳۹

---

.Ənfal» surəsi, ayə ۱۵» [۲۲] -۱

.Ənfal» surəsi, ayə ۶۵» [۲۳] -۲

.Ənfal» surəsi, ayə ۶۰ » [۲۴] -۳

.Ali-imran» surəsi, ayə ۱۴۵» [۲۵] -۴

.Ali-imran» surəsi, ayə ۱۲۲» [۲۶] -۵

.Ənfal» surəsi, ayə ۱۶» [۲۷] -۶

Ayələrdən açıq-aşkar görünür ki, döyüşdən qaçmaq İslamda böyük günahlardan .hesab olunur

İmam Əli ibn Musa ər-Riza (ə) belə buyurur: «Allah-təala cihaddan qaçmağı ona görə haram buyurub ki, dində süstlüyə, Peyğəmbər və imamların proqramlarının təhqirinə .«səbəb olur. Müsəlmanların döyüşdən qaçması səbəbindən düşmən cəsarətə gəlir

Həzrət Əli (ə) cihaddan qaçmağa münasibətini belə bildirir: «Heç zaman düşmən qoşununun qarşısından qaçmadım və kimsə meydanda mənimlə üz-üzə gəlmədi. Kim .(gəldisə, torpağı qanıyla sirab etdim»(١

**Sual ۴۶**

?Sual ۴۶: Özünü peyğəmbər məscidinin sütununa bağlayan kim idi

Cavab: Təfsirçilərin fikirincə, «Bilə-bilə Allaha, onun peyğəmbərinə və aranızdakı əmanətlərə xəyanət etməyin»(٢) ayəsi Əbu Ləbabə haqqında nazil olmuşdu. Əbu ?Ləbabə kimdir

İmam Sadiq (ə) buyurur ki, həzrət Peyğəmbərin (s) göstərişi ilə Mədinə yəhudilərindən bir hissəsi itaətsizliklərinə görə, iyirmi bir gün mühasirədə saxlandılar. Nəhayət, sülh təklif etməyə məcbur oldular. Həzrət (s) onların xəyanətkarlığından şübhələnərək, Səd ibn Məaza tabe olmalarını istədi. Lakin yəhudilər, Əbu Ləbabənin hakim olmasını .arzuladılar

Peyğəmbər (s) bu təklifi qəbul edib, Əbu Ləbabəni onların yanına göndərdi. Söhbət zamanı yəhudilər Əbu Ləbabədən Səd ibn Məaz haqqında soruşdular. Əbu Ləbabə boğazına işarə edərək, Səd ibn Məazı qəbul etməyin onlar üçün ölümə bərabər olduğunu anlatdı. Əbu Ləbabənin



---

.Nurus-Səqəleyn», ٢-ci cild səh.١٣٩» [٢٨] -١

.Ənfal» surəsi, ayə ٢٧» [٢٩] -٢

xəyanətindən Peyğəmbəri (s) agah edən ayə nazil oldu. Əbu Ləbabə hələ adı çəkilən məclisdən durmamış, şeytana uyaraq, xəyanət etdiyini anladı. Öz xəyanətindən peşman olmuş Əbu Ləbabə, özünü peyğəmbər məscidində kəndirlə sütuna bağlayıb, «Allah-təala tövbəmi qəbul etməsə, ölənədək ac və susuz qalacağam», dedi. Yeddi gün, yeddi gecə bağlı vəziyyətdə qalan Əbu Ləbabə huşunu itirəndən sonra tövbəsi qəbul oldu. Həzrət Peyğəmbər (s) özü Əbu Ləbabəni sütundan açdı. Bütün var-yoxunu .sədəqə vermək istəyən tövbəkara, «üçdə birini versən yetər» -deyə buyurdu

**Sual ۴۷**

?Sual ۴۷: Xümsün yarısının Bəni-Haşimə məxsus olması ayrı-seçkilik deyilmi

Cavab: İslamda illik gəlirin ehtiyacdan artıq qalan xərclənmiş hissəsindən tutulan beşdə bir vergi xüms adlanır. İkinci bir vergi də vardır ki, konkret sahələri əhatə edir və .zəkat adlanır

Xüms hara xərclənə bilər? İslam hökmlərinə əsasən, xüms iki yerə bölünür: İslamın tədrisi ilə məşğul olanların və Bəni-Haşim nəslindən olan fəqirlərin ehtiyaclarının .ödənilməsinə. Birinci hissə «beytül-mal», ikinci hissə isə «səhmi sadat» adlanır

Bəziləri bu fikirdədirlər ki, xümsün yarısının Bəni-Haşimə, başqa sözlə, seyidlərə verilməsi ayrı-seçkilikdir. Mütləq ədalətə əsaslanan bir dində, doğrudanmı, ayrıseçkilik .mümkündür? Sözsüz ki, xüms barədə şübhələr məlumatsızlıqdan doğur

Əvvəla, xümsün seyidlərə məxsus olan hissəsi, yalnız imanlı və fəqir seyidlərə verilə bilər. Bəzi avamların «novçası qızıldan olsa da, seyid xüms ala bilər» fikri kökündən ,yanlışdır. İkincisi, seyid olmayanlar həm xüms

həm də zəkatdan istifadə edə bilərlərsə, seyidlərin zəkatdan istifadə etmək hüquqları .yoxdur

Üçüncüsü, seyidlərin ehtiyacı xümsün ikidə birindən azla ödənərsə, onların payının .qalan hissəsini beytül-mala əlavə etmək olar

**Sual ۴۸**

?Sual ۴۸: Müqaviləni, peymanı birtərəfli qaydada pozmaq olarmı

Cavab: İslamda əhdi-peymana, müqaviləyə vəfalı qalmağa fövqəladə əhəmiyyət verilmişdir. Hətta kafirlər və düşmənlərlə müqaviləyə vəfasızlıq təkidlə pislənilmişdir. Bəs «Tövbə» surəsində müşriklərlə müqavilələrin birtərəfli qaydada ləğv olunması üçün verilmiş göstərişi necə qiymətləndirmək olar? Uyğun surənin ۷-ci və ۸-ci ayələrindən .aydın olur ki, bu müqavilələrə müşriklər elə əvvəlcədən etinasızlıq göstərirdilər

Bir insana və ya bir millətə zorla qəbul etdirilmiş müqaviləni və bir tərəfli qaydada pozmaq heç də ədalətsizlik deyildir. Çünki zəifin məcbur edildiyi bir müqavilə, özü .ədalətsizlik üzərində qurulmuşdur

Müsəlmanların uyğun müqaviləni ləğv etməsi, qəfil zərbə məqsədi daşımamışdır. Müşriklərə dörd ay müddətində möhlət verilmiş, götür-qoy üçün imkan yaradılmışdır. Əgər həzrət Peyğəmbərin (s) bu işi insani üsullara əsaslanmasaydı, Rəsuləllah bu dörd .aylıq möhlətlə düşməni yuxudan oyatmazdı

Deməm, müşrüklərlə müqavilənin birtərəfli qaydada pozulması, bu müqavilənin ədalətsiz əsaslar üzərində qurulması idi. Bu ədalətsiz müqavilə istisna olmaqla, Peyğəmbər (s) kitab əhli və sair tayfalarla bağladığı bütün müqavilələrə ömürünün .sonunadək hörmətlə yanaşmışdır

səh:۴۲

## Sual ۴۹

?Sual ۴۹: Haram pulla məscid tikmək olarmı

Cavab: Şəriət hökmlərinə əsasən, heç bir şəxsin, haram yolla qazandığı pulu xərcləmək hüququ yoxdur. «Tövbə» surəsinin ۱۸-ci ayəsində oxuyuruq: «Allahın məscidlərini yalnız Allaha və qiyamət gününə iman gətirən, namaz qılıb zəkat verən və .«Allahdan başqa heç kəsdən qorxmayanlar təmir edə bilərlər

Məscid tikməyin əhəmiyyəti barədə hədislər çoxdur. Həzrət Peyğəmbər (s) buyurur: «Hər kəs hətta quş yuvası ölçüsündə olsa da məscid tikərsə, Allah-təala behiştdə onun .«üçün bina ucaldar

Başqa bir hədisdə Həzrət (s) buyurur: «Hər kəs məsciddə bir çıraq yandırsa, nə qədər .(ki, bu çıraq məscidi işıqlandırır, mələklər onun bağışlanmasını diləyər»(۱

Məscidin abadlaşdırılması müqabilində vəd edilən mükafatlar əslində iki dəstəyə aiddir: Bunlardan biri halal pulla məscid binasını tikənlər, ikincisi məscidi mənəvi cəhətdən düzgün istiqamətdə abadlaşdıranlardır. Haram pulla məscid tikmək günah olduğu kimi, məsciddə dinlə uyuşmayan söhbətlərə yol vermək də günahdır. Bir sözlə, .(«İlk gündən binası təqva üzərində qurulmuş məscid, namaz qılınmağa daha layiqdir»(۲

## Sual ۵۰

?Sual ۵۰: Üzeyir kimdir

səh:۴۳

---

.Mühasin», səh. ۵۷» [۳۰] -۱

.Tövbə» surəsi, ayə ۱۰۸» [۳۱] -۲

.(Cavab: Qurani-kərimdə buyurulur: «Yəhudilər «Üzeyir Allahın oğludur ... dedilər»(١

Rəvayətlərdən məlum olur ki, Üzeyir yəhudi cəmiyyətinə böyük xidmətlər göstərmiş din başçılarındandır. Babil padşahının yəhudilərə divan tutduğu bir zamanda onlara böyük xidmətlər göstərən, vətənlərinə qayıtmasına nail olan, yandırılmış Tövratı .yenidən, qismən bərpa edən, məhz Üzeyirdir

Yəhudilər Üzeyiri bu xidmətləri müqabilində «Allahın oğlu» adlandırmağa başladılar. Onlar Üzeyirə bu adı hörmət mənasında verdiklərini iddia etsələr də, əslində, Allaha .şərik qoşmuşdular

İslam Peyğəmbəri (s) yəhudilərə sual verəndə ki, Musa Üzeyirdən daha əvvəl və daha .(çox xidmət etdiyi halda ona nə üçün belə bir ad verməmisiniz, yəhudilər susdular(٢

İlk əvvəl Üzeyir hörmət əlaməti olaraq «Allah oğlu» adlandırılsa da, bir müddət sonra avamlar onu həqiqətdə Allah oğlu kimi qəbul etməyə başladılar. Müasir dövrdə yəhudilər arasında belə bir əqidə nəzərə çarpmasa da, Üzeyirin yəhudilər tərəfindən .uyğun ləqəblə çağırılması, tarixi gerçəklikdir

**Sual ۵۱**

?Sual ۵۱: İsa (ə) Allahın oğludurmu

Cavab: Müasir dövrümüzdə xristian dünyasının əksəriyyəti İsanı (ə), həqiqətdə, Allahın oğlu kimi tanıyır və onu «Allahın oğlu» adlandırırlar. İlkin İncildən köklü şəkildə fərqlənən bu günkü İncillərdə, İsanın (ə) Allahın həqiqi oğlu olduğu açıq-aşkar iddia edilir. Qurani-kərimdə İsanın (ə) özünün belə bir iddiada olmadığı bildirilir. İsa (ə) .özünü yalnız Allahın peyğəmbəri kimi təqdim etmişdir

səh:۴۴

---

.Tövbə» surəsi, ayə ۳۰» [۳۲] -۱

.Nurus-səqəleyn», ۲-ci cild, səh.۲۰۵» [۳۳] -۲

Ümumiyyətlə, «ata Allah», «oğul Allah», hətta «ana Allah» kimi puç və əsassız inamlar, qədim hind və çin bütpərəstliyinə xasdır. «Tövbə» surəsinin ۳۱-ci ayəsində bu barədə deyilir: «Onlar Allahı qoyub, alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə tanrı etdilər. Halbuki, onlara ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa heç bir Tanrı yoxdur. Allah müşriklərin ona şərik qoşduğu bütlərdən uzaqdır».

Maraqlıdır ki, bir zaman Üzeyiri Allahın oğlu adlandıran yəhudilər, bu gün uyğun fikirin gülünclüyünü anlayıb, əvvəlki iddialarından əl çəkdikləri halda, xristianlar hələ də ruh yüksəkliyi ilə əvvəlki fikirlərində qalırlar. Hansı ki, müasir dövrdə şüurlu insanın Allahdan insan doğulması kimi cəfəngiyyata inanması qeyri-mümkündür. Bu, yalnız Allaha və onun göstərişlərinə imansızlıq və itaətsizlikdən doğa bilər.

## Sual ۵۲

Sual ۵۲: Əsrin imamı Mehdi (ə) nə zaman zühur edəcək?

Cavab: Dünyada zülmün ərşə dirənəcəyi bir zaman, ədalət müjdəli xilaskarın zühuru əksər təkallahlı dinlərin inancıdır. İslam dinində bu xilaskarın on ikinci imam həzrət Mehdi (ə) olduğu bildirilir: «O, bir kəsdir ki, öz rəsulunu hidayət və doğru dinlə göndərdi. Müşriklərin xoşuna gəlməsə də, onu bütün dinlərə qalib edər»(۱).

Bu ayəni təfsir edən alimlər, nəhayətdə, İslamın bütün dinlərə qalib gələcəyini və bütün yer üzünə yayılacağını xəbər verirlər. Hər il Avropa, Amerika, Afrika və dünyanın müxtəlif nöqtələrində minlərlə insanın İslam dinini qəbul etməsi, deyilənlərə əyani sübutdur. Amma mötəbər hədislərə əsasən, İslam yalnız imam Mehdinin (ə)



---

۱- [۳۴] «Tövbə» surəsi, ayə ۳۳.

zühurundan sonra bütün dünyanı tam əhatə edəcəkdir. İmam Baqir (ə) yuxarıdakı ayənin təfsirində belə buyurur: «Bu ayədə verilən vəd Məhəmməd (s) ailəsindən olan Mehdinin (ə) zühuru zamanı həyata keçəcəkdir. Həmin gün yer üzündə Məhəmməd (s) həqiqətini təsdiq etməyən bir nəfər də qalmayacaq»(١).

Eyni ayənin təfsirində imam Sadiq (ə) buyurur: «Hələ ki, bu ayənin mahiyyəti gerçəkləşməyib. O zaman gerçəkləşəcək ki, Mehdi (ə) zühur edəcək və dünyada bir nəfər də olsun kafir qalmayacaq»(٢).

Hədislərdə həzrəti Mehdinin (ə) zühur əlamətləri geniş şərh olunmuşdur. Qısaca, bunu demək olar ki, zühur ərəfəsində dünyada küfr, sitəm, günah öz son həddinə çatacaqdır. Amma bu zühurun dəqiq vaxtı haqqında məlumat, yalnız Allah-təalanın ixtiyarındadır.

### Sual ٥٣

Sual ٥٣: Var-dövlətin haram buyurulmuş «kənz həddi» necə müəyyən olunur?

Cavab: Tövbə surəsinin ٣٤-cü ayəsində var-dövlət toplayanlar haqqında ümumi bir qanun zikr edilir: «Qızıl və gümüşü toplayıb gizləyənlər, onu Allah yolunda xərcləməyənləri şiddətli bir əzabla müjdələ». Ayədəki yığılıb xərclənməyən sərvət «kənz»dir.

Gümüş və qızılın meydana çıxması, ehtiyacından artıq məhsulu, mal-qarası və s. əmlakı olanlara qızıl və gümüş toplamaq şəraiti yaratdı. Əslində, pulun yaranma fəlsəfəsi, iqtisadi əməliyyatların sürətləndirilməsindən ibarət idi. Qızıl-gümüş pulun xəzinələrdə hərəkətsiz dayanması, həmin fəlsəfə ilə daban-dabana zidd idi.



---

١- [٣٥] «Məcməül-bəyan».

٢- [٣٦] «İkmalid-din».

Yuxarıda zikr edilən ayə, xəzinələrdə hərəkətsiz sərvətlərin toplanmasını qadağan etdi. Hərəkətsiz kapital yığımı, dünyadakı iqtisadi tarazlığı pozur, kasıb təbəqənin vəziyyətini daha da ağırlaşdırır. Demək kənz, insanların iqtisadi durumunu pisləşdirən ?ölü kapitaldır. Belə bir sual ortaya çıxır ki, hansı miqdarda ölü kapital kənz hesab edilir

Məcməül-bəyan»da nəql olunur ki, həzrət Əli (ə) buyurmuşdur: «Dörd min dirhəmdən» çox xəzinə kənzdir. İstər zəkatı verilə istər verilməyə. Bundan az miqdarda sərvət yaşayış xərcliyi hesab olunur. Buna görə də, sərvət toplayanlar dərdli əzbla .«müjdələnmişdir

**Sual ۵۴**

?Sual ۵۴: Peyğəmbərin (s) sevimli səhabəsi Əbuzər nə üçün sürgün edildi

Cavab: Üçüncü xəlifə Osmana tutulan mühim iradlardan biri, həzrət Peyğəmbərin (s) sevimli səhabəsi Əbuzərin kimsəsiz səhra məntəqəsinə sürgün olunmasıdır. Əbuzər həmin şəxsdir ki, həzrət Peyğəmbər (s) onun haqqında belə buyurmuşdur: «Əbuzərdən .«düzgün bir kəsə səma kölgə salmadı, yer onu öz üstündə gəzdirmədi

Osmanla müxalifətçilikdə heç bir şəxs təmənnası olmayan Əbuzər, xəlifənin dövlət xəzinəsini öz yaxın adamlarına israfçılıqla paylaşdırmasından narazı idi. Beytül-maldan ibarət olan dövlət xəzinəsinin xərclənməsində həzrət Peyğəmbərin (s) üsullarını müdafiə edən Əbuzər, kimsəyə güzəştə getmək fikirində deyildi. Əbuzərin etirazlarından qeyzlənən xəlifə, əvvəlcə onu Şama sürgün etdi. Şamda Müaviyənin özbaşınalıqlarına qarşı

çıxan Əbuzər haqqında xəlifə məktub aldı. Müaviyə yazırdı: «Əgər Şama ehtiyacın varsa, Əbuzəri geri qaytar. O burada qalsa, Şam əlindən çıxacaq».

Osmanın göstərişi ilə qəddar məmurların nəzarəti altında nəfəs dərmədən, gecə-gündüz yol gələn Əbuzər, Mədinəyə çatanda artıq xəstələnmişdi. Xəlifənin son qərarı bu oldu ki, Əbuzər Rəbəzə çölünə sürgün edilsin. Peyğəmbərin (s) susuz səhraya sürgün edilən sevimli səhabəsi, oradaca dünyasını dəyişdi.

**Sual ۵۵**

Sual ۵۵: Fəqirlə miskin arasında fərq varmı?

Cavab: Təfsirçilərin fikirincə fəqir o şəxsdir ki, dolanışıq çətinliyi olsa da, işsiz deyil və kimsəyə ağız açmır. Miskin isə, böyük ehtiyac içində olan işsiz bir insandır və bu səbəbdən də, ağız açmağa məcburdur. Miskin sözünün lüğəti mənası, fəqirliyin təsirindən dayanmış kəsdir. Bu məna Qurani-kərimdə də təsdiq olunur. «Bələd» surəsinin ۱۶-cı ayəsində «torpağa sərilmiş miskin» ifadəsi ilə rastlaşırıq. Müxtəlif ayələrdə miskinin doyurulması haqqında verilən göstərişlər bir daha sübut edir ki, miskinlər hətta bir qarın çörəyə möhtac olan aclardır.

Hansı ki, fəqir dedikdə, maddi çətinliyə düşmüş, lakin heç zaman kimsəyə əl açmayan insanlar nəzərdə tutulmalıdır. Belə şəxslər haqqında «Bəqərə» surəsinin ۲۷۳-cü ayəsində buyurulur: «Belə şəxslər həyalı olub, dilənçilikdən çəkindiklərinə görə, nadanlar onları dövlətli hesab edirlər».

İmam Sadiqdən (ə) fəqir və miskin haqqında soruşulanda, Həzrət (ə) belə buyurdu: «Fəqir əl açmayan

.(şəxsdir. Miskinin isə, halı ondan da ağır olduğu üçün xalqa əl açır»(۱



---

.Vəsailuş-şiə», ۶-cı cild, səh.۱۴۴» [۳۷] -۱

## Sual ۵۶

?Sual ۵۶: Zəkat nədir

Cavab: İslam təkcə etiqad və əxlaq məsələləri ilə məşğul olan məktəb deyildir. Bu din öz ardıcıllarının mənəvi sağlamlığını təmin etməklə yanaşı, onların iqtisadi problemlərini də həll edir. İlkin İslam dövründən başlayaraq, bu günə qədər ehtiyaclı təbəqənin mənafeləri müdafiə olunmuşdur. həmin təbəqənin ehtiyaclarının .ödənilməsi üçün nəzərdə tutulan ən mühüm tədbirlərdən biri, zəkatdır

Şəksiz ki, bütün cəmiyyətlərdə iş qabiliyyətini itirmiş şəxslər, xəstələr, yetimlər, əlillər mövcuddur. Bu insanların himayəyə ehtiyacı vardır. Əgər cəmiyyətdə zəkat ödəməyə vəzifəli olan imkanlılar uyğun vergini ödəyərlərsə, ehtiyacılların ətrafdakılara əl açmasına lüzum qalmaz. İmam Sadiq (ə) buyurur: «Bütün xalq malının zəkatını ödəyərsə, bir dənə də olsun fəqir müsəlman qalmaz. İnsanlar yalnız varlıların günahından ac, çılpaq, evsiz-eşiksiz qalır»(۱). Elə bu səbəbdən də, İslamda zəkat vacib .(buyurulmuşdur: «Onların mallarından zəkat al»(۲

Lakin zəkat hamı üçün vacib deyildir. Zəkatı vacib edən, zəkat veriləcək şeyin miqdarının «nisab» deyilən həddə çatmasıdır. On şey nisab həddinə çatdıqda, zəkat verilməlidir: dəvə, inək, qoyun, buğda, xurma, arpa, kişmiş, qızıl, gümüş, fitrə (bədənin .(zəkatı

Məsələn, beş dəvəyə bir qoyun, otuz inəyə bir baş iki yaşa girmiş dana, qırx qoyuna bir qoyun zəkat ödənilməlidir. Say artıqca, zəkatın miqdarı dəyişə bilər. Məsələn, qoyunun .sayı üç yüz biri aşarsa, hər yüz qoyundan biri zəkat verilir



---

.Vəsailuş-şiə», ۶-cı cild səh. ۴» [۳۸] -۱

.Tövbə» surəsi, ayə ۱۰۳» [۳۹] -۲

## Sual ۵۷

?Sual ۵۷: Çətin saatda şəkk-şübhənin çarəsi nədir

Cavab: İnsanın Allah dərgahına yaxınlaşmasından, kamilliyə yetişməsindən narahat olan şeytanın ən qorxulu silahı, şəkk-şübhə yaratmaqdır. Allah, həqiqət, ədalət sevgisi .ilə çırpınan ürəyi, yalnız bu yolla məbudundan döndərmək olar

Bütün insanlar seçdikləri məqsədə doğru hərəkət zamanı çətinliklərlə üzləşirlər. Uyğun çətinliklər qarşısında yalnız qələbəyə inam hissi ilə dayanmaq olar. Şəkk-şübhəyə düşüb, haqq yolda olduğuna və bu yoldakı uğura inamını itirən insan, məhvə .məhkumdur. Bəs çarə nədir? Təbuk döyüşünü yada salaq

Təbuk döyüşündə üzücü çətinliklərlə qarşılaşan müsəlmanlardan bir hissəsi geri dönmək qərarına gəldilər. Peyğəmbərə (s) yaxın müsəlmanlardan olan Əbu Heysəmə .də evə qayıdanlardan idi

Bu hadisədən on gün keçmiş qabağında sərin su, ətrafında xoş rəftarlı arvadları bir kölgədə istirahət edən Əbu Heysəmə qəfildən dərin fikirə getdi. Düşündü ki, heç bir günahı olmayan Peyğəmbər (s) isti qumlar üstə, çiynində silah durduğu halda, onun bu kölgədə istirahət etməsi insafdan deyil. Cəld ayağa qalxıb, dəvəsinə minərək yola düşdü. Təbuka yaxınlaşan süvarini görən həzrət Peyğəmbər (s) «Ey süvari, Əbu .Heysəmə olsan, nə yaxşıdır»,-deyə buyurdu və onun haqqında dua etdi

Əbu Heysəmə münafiq deyildi. Sadəcə, süstlük ucbatından batilə meyl etmişdi. Amma ruhi hazırlığına görə, Allah-təala onun diqqətini həqiqətə yönəltdi. «Tövbə» surəsinin ۱۱۷-ci ayəsində buyurulur: «Allah çətin saatda bir qisminin ürəyi dönmək üzrə ikən, .«Peyğəmbərə (s) onun ardınca gedən mühacirlərə və ənsara tövbə nəsib etdi

**Sual ۵۸**

?Sual ۵۸: Quran riyakar insana necə təsir göstərir

Cavab: Allah-təala buyurur: «...(hər bir surə) möminlərin imanını artırar, onlar sevinərlər. Qəlblərində mərəz olanların isə, çirkinliyi artar və onlar kafir olaraq .(ölərlər»(۱

Kafirlər «bu sizin hansınızın imanını artırır»,-deyə Qurana olan etinasızlıqlarını büruzə verirdilər. Yuxarıdakı iki ayədən aydın olur ki, bir fərdin və ya bir cəmiyyətin islahı üçün təkcə göstərişlər və proqramlar kifayət deyildir. Əsas şərtlərdən biri, həmin .göstərişlərin təsirli olması üçün hazırlıqdır

Quran ayələri həyatverici yağış kimidir. Bu yağış, münbit torpağı yaşıl örtüyə bürüyür, şoranlığa təsirsiz qalır. Həqiqət aşiqləri ayələrə eşqlə dolu gözlə baxdığı halda, qəlbi çirkaba batanlar bu ayələri qara eynəklə süzür və öz küfrlərini, inadlarını daha da .artırırlar

Ayələrdə zikr edilən xəstə qəlb, xəstə ruh və ağıl mənasındadır. İnsanın əxlaqındakı nöqsanlar, bu xəstəliyin əsasını təşkil edir. Sağlam psixoloji durumda olan insanın çirkin əxlaqa malik olması, qeyri-mümkündür. Ruhun xəstəliyi, cismin xəstəliyi kimi insan təbiətinə ziddir. Ona görə də, əxlaqın pozulması, əsl təbii yoldan büdrəmənin sübutudur. İndi aydın olur ki, nə üçün Quran ayələri bəzi insanlara müsbət təsir göstərmir. Belələri üçün bütöv bir Quran oxunsa belə, zərrəcə faydası yoxdur. Özündə .Quran ayələrinə etinasızlıq görən insan Allaha sığınmalı, Ondan yardım diləməlidir

**Sual ۵۹**

?Sual ۵۹: «Ziya» və «nur» arasında fərq varmı



---

.Tövbə» surəsi, ayə ۱۲۴-۱۲۵» [۴۰] -۱

Cavab: Qurani-kərimdə rastlaşdığımız «günəşi ziyalı, ayı nurlu ... edən məhz Odur»(۱) ayəsi «ziya» və «nur» kəlmələri arasında fərq qoyulduğuna bir işarədir. Amma bu barədə rəylər müxtəlifdir. Bu iki kəlmə arasında fərq olduğunu qəbul etməyənlər olsa da, bir qrup alim bu fikirdədir ki, ziya nurun mənbəsidir. Məsələn, günəşin ziyasından nurlanan ay, yalnız işığı əks etdirir.

Uyğun ayənin davamında «ay üçün mənzillər təyin edən Odur» buyuruğu, əslində həmin dövr üçün elmi bir yenilik idi. O dövrdə elmə məlum deyildi ki, ay hərəkətdə, günəş isə nisbi sükunətdədir. Ay üçün mənzillər təyin olunması artıq aşkar bir şəkildə ayın hərəkətdə olduğunu bildirir.

**Sual ۶۰**

Sual ۶۰: Quran nə üçün möcüzə hesab olunur?

Cavab: Həzrət Məhəmmədin (s) Şəqqül-qəmər kimi möcüzələri olduğu halda, nə üçün o məhz Quranı özünə möcüzə hesab etmişdir? Quranın möcüzə olması barədə ayə və hədislərdə kifayət qədər məlumat verilir. Maraqlıdır,Quranı başqa kitablardan fərqləndirən onun hansı xüsusiyyətidir?

Musa peyğəmbərin (ə) dövründə sehrbazlıq, İsa peyğəmbərin (ə) dövründə təbabət olduqca güclü idi. Bu səbəbdən də, Allah-təala Musaya (ə) əjdahaya dönən əsa, İsaya (ə) ölülərin dirildilməsi kimi möcüzələr vermişdi. Həzrət Məhəmmədin (s) dövrü isə şerin, söz sənətinin intibah dövrü idi. Belə bir dövrdə həzrət Peyğəmbərin (s) ərəb ədəbi mühitini öz ecazı ilə heyrətə gətirən Quranla silahlandırılması tam məntiqə uyğundur. Quran bu günədək dəyişikliyə məruz qalmamış yeganə ilahi kitabdır.



---

۱- [۴۱] «Yunis» surəsi, ayə ۵.

.Quran öz ecazı və məntiqi ilə bütün həqiqətsevər düşüncələri səcdəyə gətirir

İslamın on dörd əsrlik tarixi boyu mütəmadi olaraq Quranın ilahi kitab olduğunu təsdiqləyən faktlar aşkarlanmışdır. Son dövrdə dini araşdırmalar mərkəzlərindən birində belə bir açıqlama verilmişdir ki, Quranı təşkil edən ۶۶۶۶ ayənin hər birinin nazil olduğu vaxta uyğun ölçüsü vardır. Başqa sözlə, hər bir ayə özündən əvvəl nazil olmuş ayədən uzun, özündən sonra nazil olmuş ayədən qısadır. Bu qanunauyğunluq mülahizələri ilə üst-üstə düşür. Məsələn, ən gec nazil olmuş böyük surə «Maidə» surəsinin ilk ayələri, əslində ilk illərdə nazil olmuşdur. Rəvayətə görə, həzrət Peyğəmbərin (s) göstərişi ilə bu ayələr «Maidə» surəsində yerləşdirilmişdir. Ayələrin ölçüləri uyğun fikiri tam təsdiq edir. Qurani-kərimdə ayələrinin belə bir ölçü ilə nazil .olması, insan düşüncəsinin imkanlarından xaricdir

**Sual ۶۱**

?Sual ۶۱: Ruhi sakitlik necə əldə edilir

Cavab: İnsanın psixoloji durumu onun səadətini təmin edən ilkin amillərdəndir. .Həyəcan, qorxu, qəzəb kimi ruhi təlatümlər xoşbəxtlik yolunda ciddi manielərdir

Əsrimizin insanları uyğun ruhi sarsıntılardan əziyyət çəkir, çox vaxt çıxış yolu tapmaqda aciz qalırlar. Hansı ki, öz bəndələrini əbədi səadət üçün yaratmış Allah-təala Qurani-kərimdə səadət yolunu belə göstərir: «Bilin ki, qəlblər yalnız Allahı zikr etməklə .(sakitlik tapar»(۱

Başqa bir ayədə belə buyurulur: «Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və .(onlar qəm-qüssə görməzlər»(۲



---

.Rəd» surəsi, ayə ۲۸» [۴۲] -۱

.Yunis» surəsi, ayə ۶۲» [۴۳] -۲

Allahın dostları kimdir? Ayədə övliya adlandırılan bu şəxslər, qəlblərindən dünya istəklərini çıxarmış, Allahı qəlb gözü ilə görən möminlərdir. Okean qarşısında dayanan .şəxs üçün damlanın dəyəri heçdir. Günəşlə üz-üzə dayanan şəxs çırağa etinasızdır

Qorxu nədən yaranır? İnsan, ixtiyarında olan nemətləri itirməkdən qorxur. İtirdikdən sonra isə qəm-qüssəyə batır. Dünya nemətlərinin əsarətindən azad olmuş övliyalar nə üçün qorxmalı və nə üçün də qəmlənməli imişlər?! Həzrət Əli (ə) övliyalar haqqında buyurur: «Əgər Allah onlar üçün ölüm vaxtını təyin etməsəydi, bir an olsun belə ruhları .(bədənlərində qalmazdı»(۱

Ruhi sarsıntılardan qurtarmaq üçün əyləncəyə, eyş-işrətə, musiqiyə, spirtli içkilərə, narkotikaya üz tutan və daha da dərin uçuruma yuvarlanan insanlar! «Bilin ki, qəlblər .«yalnız Allahı zikr etməklə sakitlik tapar

**Sual ۶۲**

?Sual ۶۲: Vaxtında iman gətirmiş qövm hansıdır

Cavab: «Əzab gəlməkdə ikən, Yunisin qövmündən başqa iman gətirib imandan faydalanacaq əhali kimdir?! Yunisin ümməti iman gətirən zaman, onları rüsvayedici .(əzabdan qurtardıq və müəyyən bir müddət gün-güzəran verdik»(۲

Doğrudanmı, Yunisdən başqa bütün qalan peyğəmbərlərin dəvətinə məhəl ?qoyulmamışdır

İslam Peyğəmbərinin (s) həyatından məlumdur ki, bu belə deyildir. Yunisin qövmünü başqa qövmülərdən fərqləndirən budur ki, bu qövm parçalanmadan, tam halda iman .gətirmişdir



---

.«Nəhcül-bəlağə» [۴۴] -۱

.Yunis» surəsi, ayə ۹۸» [۴۵] -۲

Tarixi mənbələrdə nəql olunur ki, bu qövm, indiki İraq ərazisinin qədim Neynəva məntəqəsində yaşayırmış. İlk əvvəl iman gətirməyən qövmündən məyus olmuş Yunis bir abidin təklifi ilə onlara nifrin edir. Həmin qövmdən olan bir alim Yunisi məyus .olmayıb, dua etməyə çağırsa da, O, qulaq asmayıb, bu qövmü tərk edir

Yunis gedəndən sonra alim öz qövmünü bir yerə toplayıb, qarşıdakı əzabın nişanələrini onlara anladır. Nəhayət, həqiqəti anlayan qövm, alimin rəhbərliyi altında şəhərdən .çıxıb, tövbə edərək dua edirlər. Onların səmimi qəlbdən etirafları əzabın qarşısını alır

## Sual ۶۳

?Sual ۶۳: Doğrudanmı, İslam qılınc dinidir

Cavab: «İslam qılınc dinidir» atmacası ilə, yalnız Qurani-kərimdən xəbərsiz insanları aldatmaq olar. Allah-təala öz peyğəmbəri Məhəmmədə (s) belə buyurur: «Əgər Rəbbin istəsəydi, yer üzündə olanların hamısı iman gətirərdi. İnsanları iman gətirməyə sənmi .(məcbur edəcəksən?!»(۱

Ayədən məlum olur ki, məcburi imanın heç bir faydası yoxdur. Bundan əlavə, insanlardan bir qrupunun iman gətirib, digər qrupunun iman gətirməməsi, onların .iradə azadlığının sübutudur

Bu gün məzlum kütlələrin qanını içib, başına mərmi yağdıran dünya zorluları, İslamı və müsəlmanları zorda ittiham edirlər. Müsəlman torpaqlarını işğal edənlər sülhsevər, vətənini müdafiə edənlər isə, terrorist adlandırılırlar. Bədənini satan qadın azad, örtüklü qadın isə, kölə kimi təqdim olunur. Bununla belə, İslam topsuz-tüfəngsiz .Avropa və Amerikada anbaan genişlənir



---

.Yunis» surəsi, ayə ۹۹» [۴۶] -۱

Yuxarıda deyilənlərdən heç də bu nəticəni çıxarmaq olmaz ki, İslam özbaşınalıq tərəfdarıdır. İslam, əqidənin zorla qəbul edilməsinə tərəfdar olmadığı kimi, cəmiyyətdəki intizamsızlıqlara da tərəfdar deyil. Bir insanın əqidə seçməkdə azad olması o demək deyildir ki, o öz istədiyi əqidəni cəmiyyətə qəbul etdirə bilər. Bir insan gizlində şərab içə bilirsə, bu o demək deyildir ki, o sərxoş vəziyyətdə cəmiyyətə çıxıb, .ictimai asayişi poza bilər

Bəli, İslam azadlıq tərəfdarıdır. Amma elə bir azadlıq ki, bəşəriyyəti əbədi səadətə qovuşdura bilsin. İslam kişinin kişi, qadının qadınla evlənməsinə «xeyr» deyir və bunu .azadlıq yox, cəhalət adlandırır

## Sual ۶۴

?Sual ۶۴: Peyğəmbəri (s) qocaldan surə hansıdır

Cavab: «Nurus-səqəleyn»də həzrət Peyğəmbərin (s) belə buyurduğu nəql olunur: «Hud» .(surəsi məni qocaltdı»(۱

Bu surənin ayələrindən alınan ümumi nəticə budur ki, müsəlmanlar heç vaxt düşmənin .çoxluğu və hücumlarının şiddətinə görə meydandan qaçmamalıdırlar

İbn Abbas nəql edir: «Həzrət Peyğəmbər (s) üçün heç bir ayə «Sənə əmr edildiyi kimi .«istiqamətlən»(۲) ayəsi qədər çətin gəlməmişdi

Yaxınları həzrət Peyğəmbərdən (s) saçının tez ağarmasının səbəbini soruşanda, .(Həzrət (s) «Hud» surəsini səbəb göstərdi(۳

Başqa bir rəvayətdə isə nəql olunur ki, «Hud» surəsinin ۱۱۲-ci ayəsi nazil olanda, Həzrət (s) buyurdu: «Ətəyinizi



---

.ci cild, səh.۳۳۴-۲ [۴۷] -۱

.Hud» surəsi, ayə ۱۱۲» [۴۸] -۲

.Məcməül-bəyan», ۵-ci cild, səh.۱۹۹» [۴۹] -۳

.(kəmərinizə keçirin». Bu hadisədən sonra Həzrəti (s) bir daha gülən görən olmadı(١)

Haqqında bəhs etdiyimiz ayədə dörd göstəriş vardır: «Sənə əmr edildiyi kimi istiqamətlən. Səninlə birlikdə iman gətirənlər də düz olsunlar. Tüğyan etməyin ki, Allah sizin nə etdiklərinizi görür»(٢). Birincisi, Həzrətin (s) istiqamətlənməsi, ikincisi, bu istiqamətin ilahi rəngdə olması, üçüncüsü, Həzrətin (s) öz ətrafındakı müsəlmanları istiqamətləndirməsi və nəhayət dördüncü göstəriş, bu mübarizədə ədalətə riayət .olunmasıdır. Başqa sözlə, istiqamət, ixlas, möminlərə rəhbərlik və həddi aşmamaq

**Sual ۶۵**

?Sual ۶۵: Dünya xoşbəxtliyində dinin rolu varmı

Cavab: Bəziləri elə düşünür ki, din yalnız axirət xoşbəxtliyi üçündür və insanın dindar .olub-olmamasının, dünya xoşbəxtliyinə heç bir dəxli yoxdur

Hansı ki, din, axirət evindən əvvəl dünya evini qorumaq üçündür. Peyğəmbər (ə) öz qövmünə xitabən deyir: «Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, çox bağışlayandır. O, sizə göydən bol yağış göndərər. O, sizə mal-dövlət, oğul-uşaq əta .(edər. O, sizin üçün bağlar-bağçalar əmələ gətirər, çaylar axıdar»(٣

Yalanın, saxtakarlığın, oğurluğun, rüşvətxorluğun cəmiyyəti məhv etməsini kim inkar edə bilər?! Zülm və sitəmin bəşəriyyəti qara günə qoyduğunu kim inkar edə bilər?! Allaha etiqadlı, peyğəmbər göstərişlərinə əməl edən, insanpərvər bir cəmiyyətin !?xoşbəxtliyinə kimdə şübhə var

Hud» surəsinin ٣-cü ayəsindəki «Ona tövbə edin ki, müəyyən bir müddət yaxşı gün-» güzəran versin» buyuruğu bir daha təsdiq edir ki, din insanın əvvəlcə



---

.«Əl-mənsur» [۵۰] -١

.Hud» surəsi, ayə ١١٢» [۵١] -٢

.Nuh» surəsi, ayə ١٠-١٢» [۵٢] -٣

.dünya, daha sonra isə axirət həyatının tənzimlənməsini nəzərdə tutur

**Sual ۶۶**

?Sual ۶۶: Təyin olunmuş ruziyə zəhmət çəkmədən nail olmaq mümkündürmü

Cavab: Quran ayələrindən məlum olur ki, ruzi təkcə maddim nemətlərdən ibarət deyildir. Bu sözün lüğəti mənası «davamlı hədiyyə» deməkdir. Ruzi anlamı qida maddələri ilə yanaşı məskən, geyim, elm, düşüncə, iman kimi nemətləri də əhatə edir. «Ali-imran» surəsinin ۱۶۹-cu ayəsində buyurulur: «Allah yolunda öldürülənləri ölü zənn etmə. Onlar öz Rəbbinin yanında ruzi içindədirlər». Ayədən göründüyü kimi ruzi təkcə maddi yox, həm də mənəvi nemətləri ifadə edir. Bərzəx dünyasında maddi nemətlərin .olmaması, buna bir sübutdur

Hud» surəsinin ۶-cı ayəsində oxuyuruq: «Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, » .«Allah onun ruzisini verməsin

Keçmiş zamanlarda insanlar okean dərinliklərində canlıların olmasına inanmırdılar. Çünki ۷۰۰ metr dərinlikdə canlı orqanizmləri qidalandıracaq bitkilər yaşaya bilməzdi. Əsli yaşıl təbiətdən götürülən əksər qidalar, okean dərinliklərinə hansı yolla çata bilərdi?! Günəş işığı olmadan həmin dərinlikdə otların cücərməsinin qeyr-mümkün olduğu şübhə doğurmur. Zaman ötdükcə okeanın dərinliyi tədqiq edildi və məlum oldu ki, uyğun dərinlikdə canlılar yaşayırmış. Sübuta yetirildi ki, günəş işığı okean səthində mikrobitkilər cücərdir. İlkin təkamül mərhələsini su səthində keçirən bu qidalar, sanki okean dibindəki süfrəyə ələnir. Demək, hansı şərait olmasından asılı olmayaraq, bütün .canlılar təyin olunmuş ruzisinə çatır

Bəs insan necə? İnsan çalışmadan, heç bir zəhmət çəkmədən təyin olunmuş ruzisini əldə edə bilərmi? Həzrət Əli (ə) buyurur: «Ruzi iki növdür. Birini sən axtarmalısan, o biri isə sənin axtarışındadır»(1).

Ayə və hədislərdən məlum olur ki, Allahın insan üçün ayırdığı ruziyə çatmaq üçün çalışmaq zəruridir. Bu işdə özünü həlak edib, haram yola əl atmağa ehtiyac yoxdur. Hər bir insan qüvvəsi qədərində çalışarsa, təyin olunmuş ruzisini əldə edə bilər. Bəs həzrət Əlinin (ə) buyurduğu ikinci növ ruzi hansıdır? Bəzən insan oturduğu yerdə ruzi əta olunmasını inkar edə bilmərik. Belə hallar olur. Amma insan oturub, təsadüflərin intizarında olmamalıdır.

### Sual ۶۷

Sual ۶۷: Allah-təala Nuhun (ə) hansı duasını qəbul etmədi?

Cavab: İlk ülul-əzm peyğəmbər olan Nuhun (ə), öz tayfasından çəkdiyi əzab-əziyyət Qurani-kərimdə geniş şərh olunmuşdur. «Biz səni ancaq özümüz kimi bir insan sayırıq» deyən bu tayfa o qədər azğınlaşımışdı ki, hətta «qorxutduğun əzabı gətir görək»-deyə meydan oxuyurdu. Nəhayət, Allahın əzabı nazil olur və Allah-təala «zülm edənlər barədə mənə müraciət etmə, çünki onlar suda boğulacaqlar»,-deyə Nuha (ə) qarşıdakı əzab barədə məlumat verir.

Nuhun gəmi düzəltdiyini görən tayfa onu məsxərəyə qoyur, hətta doğma oğlu bu işi istehza ilə qarşılayır. Allahın əmri ilə hər heyvandan bir cüt və ailə üzvlərini gəmiyə götürən Nuh (ə) oğlunu dəvət etdikdə, belə cavab alır: «Mən bir dağa sığınaram, o da məni qoruyar»(2).



---

۱- [۵۳] «Nəhcül-bəlağə».

۲- [۵۴] «Hud» surəsi, ayə ۴۳.

Su yer üzünü bürüyüb, gəmini öz ağuşuna aldıqca, əzaba düçar olan tayfa dalğalar altında görünməz olur. Oğlunu əzaba düçar olanlar içində görən Nuhun qəlbində atalıq hissi baş qaldırır. Allah dərgahına üz tutub deyir: «Pərvərdigara, oğlum mənim ailəmdəndir. Sən mənim ailəmi bu tufandan xilas edəcəyini vəd vermişdin». İstəyinə müsbət cavab alacağını ümid edən Nuh peyğəmbərə buyurulur: «O sənin ailəndən deyildir. O qeyri-saleh bir əməldir. Elə isə bilmədiyin bir şeyi məndən istəmə. Sənə cahillərdən olmamağı nəsihət edirəm»(۱).

Bir an atalıq hissinə qapılmış Nuh, dərhal peşman oldu və Allahdan bağışlanmaq dilədi. Əslində, Allahdan istənilən bir şəxsin bağışlanmasını istəmək günah deyildir. Nuh da bir insanın bağışlanmasını dua etmişdi. Onun duasının qəbul olunmaması, Allah-təalanın bütün işlərdə ədalətə istinad etməsindəndir. Günah uçurumuna yuvarlanmış, hətta qeyri-saleh əməl adlandırılmış bir şəxs, olduqca həssas bir məqamda bağışlana bilməzdi.

### Sual ۶۸

Sual ۶۸: Səadət nədir?

Cavab: Səadət və xoşbəxtlik dedikdə, yalnız dünya həyatını nəzərdə tutan insanların dini etiqadları, heç şübhəsiz ki, nöqsanlıdır. Əgər bir insana «ya əzablı həyat və xoşbəxt axirət, ya da xoşbəxt həyat və əzablı axirət» seçimi verildikdə ikincini seçirsə, onun axirət inancı həqiqi deyildir. Əbədi axirətə inanan insan, əbədi əzabı necə qəbul edə bilər?!



---

۱- [۵۵] «Hud» surəsi, ayə ۴۶.

Bu barədə Qurani-kərimdə buyurulur: «Bədbəxt olanlar od içərisində qalacaq... .(Xoşbəxt olanlar isə, cənnətdə əbədi sakin olacaqlar»(١)

Səhərdən axşama mənən və cismən axtarışda olan insanın itgisi səadətdir. Amma insan çox vaxt anlamır ki, əlində doğru ünvan olmayan yolçu çarıqlarını yırtsa belə, mənzilə çatası deyildir. Səadət bir mənzildir ki, onun ünvanını hər yoldan ötəndən soruşan kəs, bədbəxtliyə düçar olar. Bu mənzilin həqiqi ünvanı yalnız və yalnız Allah elçilərində tapılmasıdır. Peyğəmbərlərsə, səadəti təkcə dünyada yox, dünya və .axirətdə görmüşlər

İmam Sadiq (ə) cəddi həzrət Əlidən (ə) belə nəql edir: «Həqiqi səadət, insan həyatının ən son mərhələsindəki səadətdir. Həqiqi bədbəxtlik isə, ömrün günah içində başa .(çatmasıdır»(٢)

## Sual ۶۹

?Sual ۶۹: Qurani-kərimdə nə üçün dastanlara yer verilib

Cavab: Quran-Kərimin əhəmiyyətli bir hissəsi keçmişdə baş vermiş əhvalatları bəyan edir. Bu ilahi kitabla yaxından tanış olmayanlar, onu vərəqləyərkən tez-tez rastlaşdıqları dastanlardan təəccüblənir, bəziləri isə irad tutmağa da cəsarət edirlər. Amma məsələyə diqqətlə yanaşdıqda, hər şeyin məntiqəuyğun olmasına şübhə .qalmır

Tarix, insan həyatındakı müxtəlif problemlərin bir növ laboratoriyasıdır. Həyat həqiqətlərinin dərk olunmasında tarixin müstəsna əhəmiyyəti vardır. Tarixdə müxtəlif qövmlərin başına gəlmiş hadisələr, bu hadisələri doğuran səbəblər, əyani dərs (vəsaitinə bərabərdir. Həzrət Əli (ə



---

.Hud» surəsi, ayə ۱۰۶, ۱۰۸» [۵۶] -۱

.Nurus-səqəleyn», ۲-ci cild, səh. ۳۹۸» [۵۷] -۲

buyurur: «Tarixin təcrübəsindən öyrənməklə, sanki o qövmlərin birinci və sonuncusu ilə birgə yaşamışam»(۱).

Tarix və dastan xüsusi bir cazibəyə malikdir. İnsan körpəlikdən qocalanadək, bu cazibənin təsiri altında olur. Tarix və dastan hamı tərəfindən dərk olunur, hansı ki, bir məsələnin sübutu üçün gətirilən dəlilləri hamı eyni səviyyədə dərk etmir.

Yuxarıda deyilənlər bir daha sübut edir ki, Quran tarix və dastana geniş yer ayırmaqla, ən üstün təlim-tərbiyə yolunu seçmişdir.

**Sual ۷۰**

Sual ۷۰: Yuxuya inanmaq olarmı?

Cavab: Yuxu istər adi insanlar, istərsə də alimlərin daim diqqət mərkəzində olan məsələlərdəndir. Axı yuxuda gördüyümüz çirkin və gözəl, qorxulu və ürək açan səhnələr nədir? Bunlar keçmişəmi aiddir, yoxsa gələcəyə?

Müxtəlif ayə və hədislərdən məlum olur ki, yuxuların əksəriyyəti gələcəyə aid olub, qaranlıq məsələlərin üstündən pərdəni qaldırır. «Yusuf» surəsinin ۳۶-cı ayəsində oxuyuruq: «(İki gənc, Yusif peyğəmbərə dedi:) «Gəl bu yuxunu bizə yoz». Yusif belə cavab verdi: «Yeyəcəyiniz təam gəlməmişdən əvvəl, mən onun mənasını sizə xəbər verərəm. Bu, Rəbbimin mənə öyrətdiyi elmlərdəndir». Ayədən göründüyü kimi həqiqi, əsaslı və yozulası yuxular vardır. Həzrət Peyğəmbər (s) buyurur: «Yuxu üç qismdir: bir qismi Allah tərəfindən verilən müjdə, bir qismi şeytandan gələn qəm-qüssə, digər bir qismi isə, insanın bir iş barədə çox fikirləşməsinin nəticəsidir»(۲).



---

۱- [۵۸] «Nəhcül-bəlağə».

۲- [۵۹] «Biharul-ənvar», ۱۴-cü cild, səh. ۴۱۱.

İslam dinində təbiri caiz bilinən yuxu, yalnız ilahi yuxulardır. O biri yuxuların təbiri .batildir və həmin yuxulara inanmaq olmaz

**Sual ۷۱**

?Sual ۷۱: Övladlardan birinə daha çox sevginin nəticəsi nədir

Cavab: İslam dinində günah hesab edilən çirkin sifətlərdən biri həsəd, paxıllıqdır. Qəlbində həsəd tüğyan edən insanın ən yaxın adamını qətlə yetirməsi belə mümkündür. Paxıl insan bir nemətdən məhrum olduqda, başqalarının da o nemətdən məhrum olması üçün çalışır. Paxıl insanlardan qurulmuş cəmiyyət, hər an .cinayətkarlıqla qarşı-qarşıyadır

İnsanda hələ erkən yaşlarından baş qaldıran bu hissin əsas səbəbkarlarından biri, valideynlərdir. Yəqub peyğəmbərin on iki oğlu var idi. Yəqub anaları dünyasını dəyişmiş kiçik övladları Yusif və Bin Yamini daha çox sevirdi. Bu məhəbbət onun o biri oğlanlarında həsəd hissini gücləndirmişdi. «Yusif» surəsinin ۸-ci ayəsində Yusifin qardaşlarının dili ilə belə buyurulur: «...Biz bir dəstə olduğumuz halda, Yusif və onun .«qardaşı atamıza daha əzizdir. Həqiqətən, atamız açıq-aşkar səhv edir

Şübhəsiz ki, kiçik övladlarına daha çox məhəbbət göstərən Yəqub, heç bir xətaya yol verməmişdi. Onun məhəbbəti bu iki övladın fövqəladə ağıl və düşüncəsinə əsaslanırdı. Bununla belə, Quran bu hadisəni ətraflı nəql etməklə, valideynləri uyğun məsələdə daha artıq diqqətli olmağa çağırır. Çünki bir övlada məhəbbətin izharı o biri övladı o qədər sarsıda bilər ki, qəlbində doğan həsəd onu cinayətə sürükləyər. Bəzən valideynlər övladın pərişanlığını aradan qaldırmaq üçün həkimə müraciət edir, övladın .məhəbbətə ehtiyacı olduğunu anlamırlar

İmam Baqir (ə) buyurur: «Mən bəzən bir övladımı dizim üstə oturdub, ona şirniyyat verirəm. Hansı ki, o biri övladım buna daha çox layiqdir. Belə etməyimin səbəbi, onun o biri övladlarıma qarşı çıxmasının qarşısını almaqdır»(۱).

## Sual ۷۲

Sual ۷۲: Həqiqi mömin əyləncəyə vaxt sərf edə bilərmi?

Cavab: İnsan dəmir maşın deyildir ki, durmadan işləsin. Əslində, maşının da hissələri işlədikcə qızır, soyuması və yağlanması lazım gəlir. İnsan isə maşından fərqli olaraq cismlə yanaşı, ruha da malikdir. İnsanın gözü, əl-ayağı yorulub, istirahətə ehtiyaclı olduğu kimi, ruhu da yorulur və dincini almaq istəyir. İnsanı psixoloji yorğunluqdan çıxaran ən gözəl vasitə, sağlam əyləncədir. Təcrübədə sübut olunmuşdur ki, ruh yorulduqca, onun işinin keyfiyyəti aşağı enir. Qısa müddət əyləncə ilə məşğul olduqdan sonra ruh dirçəlir, yenidən işləməyə həvəs yaranır.

Həzrət Əli (ə) buyurur: «İmanlı insanın günü üç hissədən ibarətdir. Günün bir hissəsini mənəviyyatla məşğul olub ibadət edən insan, günün ikinci hissəsini maddi ehtiyaclarının təminatına sərf etməlidir. Günün üçüncü hissəsi halal ləzzətlərə sərf olunmalıdır»(۲).

Başqa bir hədisdə isə, günün əyləncəyə sərf olunan hissəsinin digər iki hissəyə kömək etdiyi bildirilir.

İmam Sadiq (ə) buyurur: «Təbukdan qayıdan peyğəmbər, öz yaxınları arasında cıdır müsabiqəsi



---

۱- [۶۰] «Biharul-ənvar», ۷۴-cü cild, səh.۷۸.

۲- [۶۱] «Nəhcül-bəlağə».

.(keçirdi. Həzrətin dəvəsinə minmiş Üsamə, cıdırda qalib gəldi»(١)

İslamda sağlam əyləncəyə o qədər əhəmiyyət verilmişdir ki, hətta bəzi müsabiqələrdə şərt də bağlamaq halaldır. Bu müsabiqələr peyğəmbər dövründə bəzən onun hakimliyi .ilə keçirilərdi. At çapmaq, ox atmaq uyğun halal müsabiqələrdəndir

Lakin unutmaq olmaz ki, İslam dini yalnız sağlam müsabiqəni qəbul edir. İnsanın cisminə və ruhuna zərərli əyləncələr cəmiyyətdə inkar olunur. İkinci bir tərəfdən, əyləncə insanın həyat idealına çevrilib, onu ruzi qazanmaq və ibadətdən saxlamamalıdır. Əgər əyləncəyə aludə olmuş insan namazın vaxtını ötürürsə, bu .sayaq əyləncəni heç vəchlə məqbul hesab etmək olmaz

### Sual ٧٣

?Sual ٧٣: Ən gözəl səbir hansıdır

Cavab: Ayə və hədislərdə möminlər üçün zəruri hesab edilən sifətlərdən biri də, səbirdir. Üzücü hadisələr qarşısında dözüm göstərib, bədbinliyə qapılmamaq, insan şəxsiyyətinin ucalığına bir dəlildir. Oğlu Yusifin qanlı köynəyini görən Yəqub, «Mənə, .yalnız tükənməz, dözümlü səbir gərəkdir»(٢) deyir

Kiçik gölməçənin suyunu zəif bir külək dalğalandırdığı bir halda, əzəmətli Sakit okean tufanlar qarşısında öz müvazinətini itirmir. Bəzən insan zahirən dözümlülük göstərsə də, danışdığı sözlərdən naşükrlük və səbirsizlik duyulur. Lakin həqiqi imana malik .insanlar, heç zaman sarsılıb, bədbin sözlər danışmırlar. Ən gözəl səbir də elə budur



---

.Səfinətül-bihar», ١-ci cild, səh.۵۹۶» [۶٢] -١

.Yusif» surəsi, ayə ١٨» [۶٣] -٢

Bəs nə üçün Yəqub peyğəmbər oğlu Yusifə görə gözləri kor olanadək ağladı? Nə üçün başqalarına ağlamamağı tövsiyə edən İslam Peyğəmbəri (s), oğlu İbrahimi itirdiyi zaman göz yaşları axıtdı? Həzrət Peyğəmbər (s) bu sualın cavabında buyurur: «Göz ağlayır, qəlb pərişan olur, amma dilimə Allahı qəzəbləndirəcək bir söz gəlmir»(١).

İnsanın sinəsikdəki daş yox, qəlbdir. Ağlamaq təbiidir. Gözdən yaş gəlməsi yox, Allahı qəzəbləndirəcək söz deyilməsi eyibdir.

### Sual ٧۴

Sual ٧۴: Misir padşahı, Yusifə eşq elan etmiş arvadını nə üçün cəzalandırmadı?

Cavab: Qurani-kərimdə buyurulduğu kimi, qardaşları Yusifi səhraya aparıb, orada onu bir quyuya atdılar. Yoldan keçən karvan əhli Yusifi tapıb, Misir padşahının vəzirinə satdı. Nəhayət, padşahın evində yerləşən Yusif, onun arvadının xəyanətkar hərəkətləri ilə üzləşdi. Yusifə meyl salmış qadın, onu yoldan çıxara bilmədiyini görüb, böhtana əl atdı. Lakin Misir padşahı Yusifin günahsızlığını və arvadının xəyanətkarlığını gözəl anlayırdı. Bununla belə, arvadını cəzalandırmaqdan vaz keçib, Yusifi zindana saldırdı.

Padşahın arvadının xəyanətkarlığı bütün ətrafdakılara məlum olduğu halda, ixtiyar sahibi olan ərinin onu cəzalandırmaması ilk baxışdan təəccüb doğurur. Belə böyük bir xəyanət qarşısında Misir padşahı bir cümlə deməklə kifayətlənir: «Ey arvad, bağışlanmanı dilə, çünki, həqiqətən, günah edənlərdənsən»(٢).

Bəzi təfsirçilər padşahın rüsvay olmaq qorxusundan bu xəyanəti açıb-ağartmadığını səbəb göstərsələr də, əksər



---

١- [۶۴] «Biharul-ənvar», ٢٢-ci cild, səh.١۵٧.

٢- [۶۵] «Yusif» surəsi, ayə ٢٩.

təfsirçilərin göstərdiyi ikinci səbəb, daha məntiqə uyğundur. Onların fikirincə, axirət dünyasına etiqadsız zalım başçılar, zahirdə özlərini qeyrətli-namuslu göstərsələr də, əsl həqiqətdə, onların xarakterində belə xüsusiyyətlər yoxdur. Dünya nemətlərinə görə millətə zülm edən, millətin qızlarının iffətini düşünməyən başçıların qeyrətli !olduğunu zənn etməyə heç bir əsas yoxdur

Züleyxa gözəl idi və Misir padşahı onun xəyanətini gözəlliyinə bağışlamışdı. Məhz onun bu rəftarı səbəbindən, Züleyxa hətta xəyanəti açıldıqdan sonra belə, Misirin varlı .qadınlarına öz eşqi barədə açıq-aşkar danışırdı

**Sual ٧۵**

?Sual ٧۵: Allahın kölgəsində olmaq nə deməkdir

Cavab: Sözsüz ki, «Allahın kölgəsi» ifadəsi məcazi məna daşıyır. İnsan çətinliklər, gözlənilməz üzücü hadisələr zamanı, yalnız Allaha sığınmalı və ondan yardım diləməlidir. Allahın lütfü olmadan hər hansı çətinlikdən qurtulmuş qeyri-mümkündür. Allah-təalanın lütfünə bu sayaq dərin bağlılıq, insanı əbədi səadətə çatdırır. Dünya həyatı boyu Allahın lütfündən faydalanan insan haqqında məcazi olaraq, «bu şəxs .Allahın kölgəsidir», deyirlər

Həzrət Peyğəmbər (s) bir hədisdə belə buyurur: «Yeddi dəstə insanı Allah-təala öz ərşinin kölgəsində yerləşdirmişdir (O zaman ki, onun kölgəsindən başqa kölgə yoxdur): ədalətli rəhbər; ömrünün əvvəlindən Allaha bəndəlik etmiş gənc; qəlbi Allahın ibadətgahına bağlı olan və hər zaman ora dönmək barədə düşünən şəxs; Allaha itaət yolunda başqaları ilə birlikdə çalışan və onlardan ayrıldıqda belə, ruhən onlarla olan şəxs; Allahın adı çəkiləndə, gözündən yaş gələn şəxs; gözəl qadının dəvəti qarşısında «mən Allahdan qorxuram»

.(deyən şəxs; ehtiyaclılara yardım göstərib, sədəqəni gizlində verən şəxs»(۱)

### Sual ۷۶

Sual ۷۶: Cəmiyyətdəki ictimai-siyasi dəyişikliklərin səbəbkarı kimdir? İnsan, yoxsa ?Allah

Cavab: Allah-təala buyurur: «Hər hansı bir tayfa öz vəziyyətini dəyişməsə, Allah da .(onun vəziyyətini dəyişməz»(۲)

Ayədən göründüyü kimi, bütün millətlərin talehi, onların öz əllərindədir. Onların xoşbəxtlik və bədbəxtliklərinin ilkin səbəbkarı özləridir. Öz xoşbəxtliyi üçün çalışmayan .millətin Allah-təaladan nə isə gözləməsi, əbəsdir

Ayə və hədislərin göstərişlərinə əsasən, cəmiyyətdəki bədbəxtlikləri aradan qaldırmaq istəyən millət, ilk əvvəl öz düşüncəsində inqilab etməlidir. Öz imanı, əxlaqındakı zəif nöqtələri tapıb, xalis bir tövbə ilə çirkinlikdən təmizlənməyən cəmiyyətin səadətə çatması mümkünsüzdür. «İnsanın xoşbəxtliyi və bədbəxtliyində Allah təsirsizdir» demək də düzgün deyildir. Allah-təala hər bir insanı təqib edib, qoruyan mələklər qərar vermişdir. Onlar doğru yol seçənlərə yardım göstərərlər. Azğınlığı seçənlərin isə, əzabı artırılar. Məsələn, ədalət və həqiqət uğrundən canından keçən millətlər, ədalətli hakimlə mükafatlandırılır, günah və azğınlığa meyilli millətlər isə, zalım hakimlə .cəzalandırılırlar

### Sual ۷۷

?Sual ۷۷: Məsəl çəkməyin hansı faydaları var

Cavab: Hər hansı bir məsələnin izahı üçün məsəl çəkməyin faydası inkar edilə bilməz. İnsanlar müxtəlif



---

.Səfinətül-bihar», ۱-ci cild, səh. ۵۹۵» [۶۶] -۱

.Rəd» surəsi, ayə ۱۱» [۶۷] -۲

səviyyəli istedada malik olduqlarından dinlədikləri mövzunu anlamaya da bilərlər. .Məsəl çəkildiyi zaman iti ağıla malik olmayanlar üçün də qaranlıq nöqtələr işıqlanır

Qurani-kərim bütün bəşəriyyətə ünvanlandığından onun müxtəlif surələrində kifayət .qədər misallar çəkilir

Bəs Qurani-kərimdə müxtəlfi mövzuların izahı üçün çəkilmiş məsələlərin konkret hansı ?faydaları vardır

Adətən, hiss üzvləri ilə inanan insan bəzi mürəkkəb əqli məsələləri anlamaqda . ١ çətinlik çəkir. Çəkilmiş məsəl onun düşüncəsinin mümkün qədər əqli həqiqətlərə .yaxınlaşdırır. Bir növ hisslər ən uca nöqtədən baxmağa başlayır

.Çəkilmiş misallar bir məsələnin sübutu üçün gətirilmiş dəlillərin təsirini gücləndirir .٢

.Məsəl çəkmək bir növ elmi dilin sadələşdirilməsidir .٣

.Məsəl mövzunu əql dilindən hiss dilinə tərcümə edir .۴

.Mövzu məsəl qəlibinə töküldükdən sonra höcət insanların bəhanəsi kəsilir .۵

**Sual ٧٨**

?Sual ٧٨: Behiştin neçə qapısı vardır

Cavab: Ayə və hədislərdən məlum olur ki, behişt müxtəlif qapılara malikdir. Bu qapıların çoxluğunun səbəbi, heç də bir qapıdan daxil olmağın çətinliyi deyildir. Bu qapılar hər hansı tayfa və təbəqə üçün də nəzərdə tutulmamışdır. Bir çox saraylarda .qapıların çoxluğunda məqsəd tamam başqadır

səh:٧٠

Rəvayətlərdə nəql olunur ki, behiştin müxtəlif adlı qapıları vardır. Bu qapılardan biri «mücahidlər qapısıdır». Bu qapıdan din yolunda vuruşmuş mücahidlərin behiştdə daxil .olacağı və mələklərin onları salamlayacağı bildirilir

İmam Sadiq (ə) buyurur: «Behiştin səkkiz qapısı vardır və onlardan hər biri eni qırx illik yol uzunluqdadır». Hədisdən aydın olur ki, behişt qapısı bizim düşündüyümüz qapı .anlamında deyildir

Hicr» surəsinin ۴۴-cü ayəsində cəhənnəmin yeddi qapıya malik olması bilindirməklə,» .səadətə daha çox yol olduğuna işarə vurulur

**Sual ۷۹**

?Sual ۷۹: Fəsad nədir

Cavab: Əvvəlcə onu qeyd edək ki, «fəsad» «səlah»ın antonimidir. Dini mənbələrə istinad etsək, görərik ki, fəsad əşyanın istər az, istərsə də çox miqdar tarazlıq halından çıxmasıdır. Səlah isə, onun ziddinə olaraq, tarazlıq halətidir. Sadə dillə desək, fəsad, günah və fitnə, səlah isə savab və xeyirdir. Bütün fərdi və ictimai fəaliyyətlərdəki ifratçılıq və təfritçilik fəsad hesab edilir. Qurani-kərimin müxtəlif ayələrində bu :mövzuya toxunulur

.(Yer üzündə fəsad törədər və islah olmazlar»(۱)»

.(Allah-təala fəsad törədənləri, saleh əməl sahiblərindən fərqləndirir»(۲)»

.(İslah ol və fəsad törədənlərin ardınca getmə»(۳)»

.(İman gətirib saleh iş görənləri, yer üzündə fəsad törədənlərlə eyni tutmarıq»(۴)»



---

.Şüəra» surəsi, ayə ۱۵۲» [۶۹] -۱

.Bəqərə» surəsi, ayə ۲۲۰» [۷۰] -۲

.Əraf» surəsi, ayə ۱۴۲» [۷۱] -۳

.Sad» surəsi, ayə ۲۷» [۷۲] -۴

Müxtəlif ayələrdə fəsad törətmək Allah və peyğəmbərlərlə vuruşmaq, insanın qətli hər .cür azğınlıqa aid edilir

Yer üzündə fəsad törədənlər sırasında ilkin adı çəkilənlərdən biri Firondur. Artıq həlak olacağını anlayan Firon iman gətirdiyini bildirəndə, ona buyurulur: «İndimi? Halbuki, .(əvvəlcə Allaha qarşı çıxmış və fəsad törədənlərdən olmuşdun»(١

Bəzən oğurluq fəsad hesab edilir. Yusif peyğəmbərin qardaşları oğurluqda ittiham .(olunduqları zaman deyirlər: «Biz, Misir torpağına fəsad salmaq üçün gəlməmişik»(٢

**Sual ٨٠**

?Sual ٨٠: Şimşəyin faydası varmı

Cavab: Bildiyimiz kimi, şimşək mənfi və müsbət yüklü iki buludun bir-birinə yaxınlaşmasından yaranır. Bu hadisə, mənfi və müsbət yüklü iki naqil bir-birinə toxunduqda qığılcım yaranmasının oxşarıdır. Bütün təbiət hadisələrində istər cəmiyyət, istərsə də təbiət üçün faydalar olduğunu bilirik. Bəs şimşəyin faydası nədir? Qurani-kərimdə buyurulur: «Sizə qorxu və ümid məqsədi ilə şimşək göstərən, ağır .(buludları yaradan da Odur»(٣

Ayədən göründüyü kimi, şimşəyin ilkin faydası, insanları Allah-təalanın əzəmətindən xəbərdar etməkdir. Buludla yer arasında yaranan belə şimşəkləri «saiqə» adlandırmışlar. Müsbət yüklü bulud həmişə mənfi yüklü yerə yaxınlaşdıqda, saiqə .yaranır. «Allah onların vasitəsi ilə istədiyini vurar» ayəsində saiqə nəzərdə tutulur

Təbiətin zarafatı» adlandırılan şimşəyin, bir sıra təbii faydaları da vardır. On beş min» dərəcə santiqrad istilik



---

.Yunis» surəsi, ayə ٩١» [٧٣] -١

.Yusif» surəsi, ayə ٧٣» [٧٤] -٢

.Rəd» surəsi, ayə ١٢» [٧٥] -٣

yaradan şimşəklər, havanı yandırır və bunun ardınca havanın təzyiqinin dərhal enməsi nəticəsində buludlardan yağış yağır. Həmin yüksək temperaturda yağış damlaları artıq oksigendən yaranır və belə su, «ağır su» adlanır. Bu suyun formulu N…O… -dir. Ağır su .isə, güclü mikroböldürücü xüsusiyyətə malikdir

Yüksək temperaturda yaranmış yağış damlalarının tərkibində karbon turşusu .olduğundan, bu yağış həm də torpaq üçün gübrə funksiyasını daşıyır

**Sual ۸۱**

?Sual ۸۱: Quran «hamı səcdədədir» buyurarkən, nəyi nəzərdə tutur

Cavab: Bütün hadisələr iki mümkün mahiyyətdən birini daşıyır. Onlar ya təkvinidir (fitri, təbii), ya da təşri´idir (iradi). Səcdə təvazö, təslim əlamətidir. Əql mülkü ilə mükafatlandırılmış bəşəriyyət Allahın səcdəsinə dəvət edilir və bu əmrə itaət edənlərin səcdəsi iradidir. Amma təbiətdə baş verən hadisələr təşri´idir. Yəni onun iradəsindən asılı deyil. «Rəd» surəsinin ۱۵-ci ayəsində belə buyurulur: «Göylərdə və yerdə kim varsa, özləri də, kölgələri də səhər-axşam, istər-istəməz Allaha səcdə edər». Ayədəki «istər-istəməz» kəlmələri aşkar göstərir ki, nəzərdə tutulan səcdə təşri´i yox, təkvinidir. Bəs ?bu hansı səcdədir

Bu barədə təfsirçilər müxtəlif fikirdədirlər. Bir qrup təfsirçinin fikirincə, ayə bütün .kainatda ilahi qanunların hökm sürdüyünə bir işarədir

Digər bir qrup təfsirçi isə, ayədə bütün mövcudların kölgələrinin səcdəsindən danışıldığını bildirirlər. İstər insan, istər təbiətin hər hansı bir elementi kölgəyə malikdir. Səhərlər bir istiqamətdə kölgə günorta düzəlir, axşam isə

.əks istiqamətə yönəlir. Kölgənin bu hərəkəti səcdəni xatırladır

**Sual ۸۲**

?Sual ۸۲: Haqqı nahaqdan necə fərqləndirmək olar

Cavab: Haqq və nahaqı tanımaq bəzən o qədər çətin olur ki, bu iki anlamın əlamətlərini bilməyə ehtiyac yaranır. Ayədə oxuyuruq: «...Sel, üstünə çıxan bir köpüyü alıb apardı. Bəzək şeyləri və ya qab-qacaq düzəltmək məqsədi ilə insanların od üzərində qızdırıb əritdiklərinin üstündə də buna bənzər bir köpük vardır. Allah haqq ilə batili ayırd etmək üçün belə misallar çəkir. Köpük heç bir şey olmadığı üçün uçub gedər. İnsanlara fayda .(verən bir şey isə, yer üzündə qalar»(۱

Həqiqət həmişə saf su kimi həyatvericidir. Batildə isə heç bir fayda yoxdur. Batil .zahirdə təkəbbürlü, məqmpərəst, səs-küylü, daxildə isə puçdur

Həqiqət özünə güvəndiyi halda, batil həqiqətin hörmətindən istifadə edir. Batil həmişə həqiqət libası geyir. Əgər dünyada doğru söz olmasaydı, yalana kim inanardı?! Əgər !?qızıl olmasaydı, qızıl suyuna salınmış dəmirə kim aldanardı

Həzrət Əli (ə) «Nəhcül-bəlağədə» buyurur: «Əgər batil həqiqət qatqısından ayrılsa, həqiqət sevərlər üçün aşkarlanacaq. Əgər həqiqət batil qatqısından qurtulsa, .«sözbazların ağzı yumulacaq

Batil qatışıqlığa, özbaşınalığa tərəfdardır. Çöl-biyabanı ağuşuna alan sel nə qədər ki, hərəkətdədir, ona qatışmış zir-zibil gözə dəymir. Elə ki, suda sakitlik yaranır, zir-zibil .suyun dibinə çöküb, saf sudan ayrılır



---

.Rəd» surəsi, ayə ۱۷» [۷۶] -۱

Həqiqət səhnədə görünən kimi, batil səhnəni tərk etməyə məcburdur. Ona görə də, .həqiqət həmişə hərəkətdə olub, yerini batilə verməməlidir

**Sual ۸۳**

?Sual ۸۳: Alın yazısını pozmaq olarmı

Cavab: Qurani-kərimdə buyurulur: «Hər dövrün bir kitabı var. Allah istədiyi şeyi məhv .(edər, istədiyini də sabit saxlayar. Kitabın əsli Onun yanındadır»(۱

Əsl kitab» kimi tərcümə olunmuş ifadə, Qurani-kərimdə «ümmül-kitab» kimi verilmişdir.» .«Buruc» surəsinin ۲۲-ci ayəsində bu kitab «lövhi-məhfuz» adlandırılmışdır

Varlıq aləminin və hadisələrin gerçəkləşməsi, iki mərhələdən keçir: Birinci mərhələdə hər şey sabitdir və hər hansı kənara çıxma halları, qeyri-mümkündür. Bu birinci mərhələ lövhi-məhfuza aiddir. İkinci qeyri-sabit mərhələ isə, «lövhi-məhv və isbat»da .öz əksini tapmışdır

Məsələn, nəzərdə tutulur ki, insan zəhər içərsə ölər. Belə bir ölüm lövhi-məhfuzda yox, lövhi-məhv və isbatda qeyd olunmalıdır. Zəhəri təsirsizləşdirən maddənin mövcudluğu, uyğun ölümü qeyri-sabit edir. Çünki zəhər içmiş adam, həmin maddəni .qəbul edərsə, ölümdən qurtular

İstər təbiiət, istərsə də cəmiyyətdə bir-birindən doğan hadisələrlə qarşılaşırıq. Ayə və hədislərdə bir əməlin nəticəsində hansısa bir başqa hadisənin baş verəcəyi barədə xəbərdarlıqlar çoxdur. Həzrət Peyğəmbər (s) buyurur: «Ehtiyaclılara düzgün şəkildə kömək, ata-anaya yaxşılıq, hər hansı xeyir əməl bədbəxtliyi səadətə çevirər, ömürü .(uzadar, bəlaların qarşısını alar»(۲



---

.Rəd» surəsi, ayə ۳۸-۳۹» [۷۷] -۱

.Əl-mizan» ۱۱-ci cild, səh.۴۱۹» [۷۸] -۲

Demək, alın yazısı adlandırılan məfhum, olacaqlar barədə iki kitabda ... lövhi məhfuz və lövhi məhvə və isbatda yazılanlardır. Birincidə yazılanlar dəyişməz, ikincidə yazılanlar .isə, dəyişgəndir

**Sual ۸۴**

?Sual ۸۴: «Allahın günləri» hansı günlərdir

Cavab: Qurani-kərimi nəzərdən keçirərkən, belə bir ayə ilə rastlaşırıq: «Biz Musaya «tayfanı zülmətdən nura çıxar və Allahın günlərini xatırlad, bunda səbir və şükr edənlər .(üçün ibrətlər var» deyib, onu möcüzələrimizlə göndərdik»(۱

?Əyyamullah» kəlməsindən tərcümə olunmuş «Allahın günləri» hansı günlərdir»

İmam Baqir (ə) buyurur: «Allahın günləri imam Mehdinin (ə) qiyam günü, rəcət günü və .qiyamət günüdür»(۲). Bəzi hədislərdə rəcət günü əvəzinə, ölüm günü göstərilmişdir

Böyük günlərin xatırlanması, millətlərin əhval-ruhiyyəsində dərin iz salır. Dünyadakı əksər millətlər diktator rejimindən qurtulub, hürriyyət qazandıqları günü əzəmətlə .qeyd edirlər

Allah günləri xatırlanması isə, insanı rəzil hisslərdən uzaqlaşdırır, onu Allah, vətən və xalq qarşısında öz vəzifələrini yerinə yetirməyə vadar edir. Ölümü, qiyamət sorğusunu .yaddan çıxarmayan insanın, şeytanın təhriki ilə günaha batması qeyri-mümkündür

**Sual ۸۵**

?Sual ۸۵: «Təvəkkül» nədir

Cavab: «İbrahim» surəsinin ۱۱ və ۱۲-ci ayələrində buyurulur: «Möminlər yalnız Allaha .təvəkkül etsinlər



---

.İbrahim» surəsi, ayə ۵» [۷۹] -۱

.Nurus-səqəleyn», ۲-ci cild, səh.۵۲۶» [۸۰] -۲

.«!?Allah bizə yollarımızı göstərdiyi halda, biz nə üçün Ona təvəkkül etməməliyik

Təvəkkül» «vəkalət» kəlməsindəndir və vəkil seçmək mənasını verir. Yaxşı vəkildə dörd» .sifətin olması zəruridir: agahlıq, düzlük, qüdrət, mərhəmət

Vəkilə o zaman ehtiyac yaranır ki, insan özünü müdafiə etməyə qadir olmur və .qarşısına çıxan çətinliyi başqa birinin köməyi ilə aradan qaldırmaq istəyir

Mömin insanın nəzərində bütün qüdrətlərin fövqündə duran Allah-təala, istənilən hadisə və çətinlik zamanı yeganə etibarlı vəkildir. Allaha təvəkkül edən mömin .fəaliyyətsiz dayanmır. Hətta qüvvəsi çatan işdə də, əsl səbəbkar Allahı bilir

Allaha təvəkkül, çətinliklər zamanı insanın müqavimətini artırır. Qurani-kərimin :müxtəlif ayələrində belə müqavimətin nümunələri ilə rastlaşırıq

.(Allaha təvəkkül, cihad meydanında iki vuruşqan tayfanın süstlüyünün qarşısını aldı»(۱»

.(İşdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə, Allaha təvəkkül et»(۲...»

O şəxslər şeytana müqavimət göstərib, onun təsirindən çıxa bilərlər ki, iman və» .(təvəkkülə malik olsunlar»(۳

Allaha təvəkkülün təbii gedişatla zidd olduğunu düşünənlər yanılırlar. Təbii səbəbləri Allahın iradəsindən ayrı bilmək, şirk hesab olunur. Şirk isə, cəhənnəm odu vəd edilmiş .günahlardandır

### Sual ۸۶

?Sual ۸۶: Kəşf və ixtira üçün ilahi mükafat varmı



---

.Ali-imran» surəsi, ayə ۱۷۳» [۸۱] -۱

.Ali-imran» surəsi, ayə ۱۵۹» [۸۲] -۲

.Nəhl» surəsi, ayə ۹۹» [۸۳] -۳

Cavab: Əgər kəşf və ixtiralar tarixinə nəzər salsaq, alimlərin bu yolda çəkdikləri üzücü zəhmətlərə şahid olarıq. Onlar min bir əzab-əziyyətə qatlaşaraq, öz yenilikləri ilə bəşəriyyətə böyük faydalar vermişlər. Məşhur fizik Edisson elektrik cərəyanının kəşfi yolunda nəinki əziyyət çəkmiş, hətta həyatını qurban vermişdir. Nəticədə, dünyanın qaranlıq gecələri işıqlanmış, zavod və fabriklər hərəkətə gəlmiş, bir sözlə, həyat yeni rəng almışdır. Ortaya belə bir sual çıxır: necə ola bilər ki, həyatını bəşəriyyət yolunda fəda etmiş bir insan imanı olmadığı üçün cəhənnəmə, əlini ağdan qaraya vurmamış bir ?müsəlman isə, behiştə getsin

İmam Kazim (ə) buyurur: «Bəni-İsraildə biri imanlı, o biri isə kafir olan iki qonşu vardı. Kafir qonşu öz imanlı qonşusu ilə çox gözəl rəftar edərdi. O, dünyasını dəyişdi. Mömin qonşusu ilə yaxşı rəftarlarına görə, axirətdə onu oddan qoruyacaq bina ilə .(mükafatlandırıldı»(١

Çox olub ki, məscid və ya mədrəsə tikən bir şəxsin niyyəti Allahı razı salmaq yox, hansısa şəxsi mənafelər olub. Əksinə, imkansız bir şəxs sırf Allahın razılığı üçün çox kiçik bir iş görüb. İslam dinində bütün əməllər niyyətin saflığı ilə ölçüldüyü üçün, ikinci .şəxsin kiçik işi daha üstündür

Əgər alim maddi təmənnaya, vəzifə və şöhrətə görə əziyyət çəkmişsə, heç bir ilahi mükafat gözləməməlidir. Onun gördüyü iş günah hesab olunmur, amma savabı da .yoxdur

**Sual ٨٧**

?Sual ٨٧: Uzun-uzadı, əlçatmaz arzular bizə nə verir

Cavab: Ümid və arzu insan fəaliyyətinin əsas amillərindəndir. Əgər insan bircə gün bu hissdən məhrum



---

.Biharul-ənvar», ٣-cü cild, səh.٣٧٧» [٨۴] -١

olsa, yaşayış nizamı pozular. Həzrət Peyğəmbər (s) buyurmuşdur: «Ümid, mənim ümmətimin mərhəmət mayasıdır. Əgər ümid nuru sönsəydi, heç bir ana övladına süd vermaz və heç bir bağban fidan əkməzdi»(1).

Lakin həyat və hərəkət amili olan ümid və arzu həddi aşıb ifrata vararsa, uzun-uzadı, əlçatmaz arzulara çevrilər. Ayədə buyurulur: «Qoy kafirlər hələ yeyib içsinlər, ləzzət alsınlar, arzuları, ümidləri başlarını qatsın. Sonra biləcəklər»(2). Ayədə zikr edilən arzu-ümid həmin məhvedici uzun-uzadı arzulardır. Bütün həyatı boyu hücumlara hədəf olan insan yalnız ayıq-sayıq olarsa, qoruna bilər. Uzun-uzadı arzular isə insanın başını qatıb, onu yuxuya verir.

Həzrət Əli (ə) buyurur: «Camaat! Sizin üçün çox təhlükəli iki şeyə görə qorxuram: nəfs istəklərinə itaət və uzun-uzadı arzular. Nəfs istəkləri sizi həqiqətdən uzaqlaşdırar, uzun-uzadı arzular isə, axirəti yadınızdan çıxarar»(3).

Ətrafa diqqətlə nəzər ,lıqlara çevrildiklərinin şahid olarıq. «Kumeyl» duasında oxuyuruq: «Uzun-uzadı arzular məni gerçək, faydalardan məhrum etdi». El arasında gözəl bir deyim də var: «Çox istəyən, azdan da olar».

### Sual ۸۸

Sual ۸۸: Quranı təhrif etmək mümkündürmü?

Cavab: Bəşər tarixində dəyişikliyə məruz qalmamış yeganə kitab, Qurani-kərimdir. Qurandan əvvəl nazil olunmuş bütün səmavi kitablar təhrif olunmuşdur.



---

۱- [۸۵] «Ali-imran» surəsi, ayə ۱۵۹.

۲- [۸۶] «Hicr» surəsi, ayə ۳.

۳- [۸۷] «mənbə kamil deyil} «Nəhcül-bəlağə}.

Hicr» surəsinin ۹-cu ayəsində buyurulur: «Şübhəsiz ki, Quranı biz nazil etdik və sözsüz» ki, biz də onu qoruyub saxlayacağıq». Quranın bu sayaq ciddi qorunmasının əsas səbəbi, əvvəlki ilahi kitabların kafirlər tərəfindən təhrif olunmasıdır. Ötən on dörd əsrdə uyğun təcavüzlərə dəfələrlə məruz qalmış Qurani-kərim, vəd olunduğu kimi .qorunmuşdur

Hicri IV əsrin böyük alimlərindən olan Seyid Mürtəza deyir: «Məkkənin, Mədinənin varlığına kim şəkk edə bilər?! Monqolların İrana hücumuna, böyük Fransa inqilabına, I və II dünya müharibələrinə kimdə şəkk var?! Deyilənlər haqqında kifayət qədər məlumatlı olmağımız, heç bir şəkk-şübhəyə yer qoymur. Qurani-kərim də belədir. Onun hər bir ayəsi haqqında malik olduğumuz ətraflı məlumat, bütün şübhələri aradan .«qaldırır, təcavüzlərin qarşısında keçilməz sədd çəkir

**Sual ۸۹**

?Sual ۸۹: Şeytanları qovan «şihab» nədir

Cavab: Allah-təalanın elm və qüdrətinə gözəl nümunələrdən biri, başımız üzərindəki səmada baş var hadisələrdir. İnsan düşüncəsini heyrətə gətirən bu səhnələrdə düşünənlər üçün böyük ibrətlər vardır. «Hicr» surəsinin ۱۶-cı ayəsində buyurulur: «Biz .«səmada bürclər yaratdıq, onları baxanlar üçün bəzədik

Səmadakı bürclər günəş və ayın mənzillərinə bir işarədir. Müxtəlif fəsillərdə yerdən baxarkən günəş və ay müəyyən bir bürcə yaxın görünür. Bu vaxt məsələn, «günəş filan bürcdədir» deyirik. Allah-təalanın varlığına şəhadət verən bu nizam-intizam qarşısında kafir qövm yenə də öz küfründən əl götürmür. Uyğun surənin ۱۴-cü ayəsində oxuyuruq: «Əgər onlara göydən bir qapı açsaq və durmadan yuxarı dırmaşsalar, yenə .«də inanmazlar

ayəmində isə belə buyurulur: «Lakin şeytanlardan kim xəlvəti qulaq assa, onu odlu ١٨ .«bir axan ulduz (şihab) təqib edər

Təfsirçilər dünyamıza məxsus bəzi məlumatların səmada əks olunduğu və şeytanın bu məlumatları əldə etmək üçün orada vurnuxduğunu bildirirlər. Onların fikirincə, «şihab» .onları təqib edib, qovan meteoralardır

**Sual ٩٠**

?Sual ٩٠: Cinlər nə üçün gözə görünmür

Cavab: «Cin», insanın hiss üzvlərinin duymadığı varlıq mənasını verir. «Məcnun» da «cin» kəlməsindəndir və «ağıl qüvvəsi fəaliyyətsiz olan insan»a deyilir. Ana bətnindən .bürünmüş uşaq «cənin», torpağı ağaclarla örtülmüş bağ «cənnət» adlanır

Qurani-kərimin buyuruğuna əsasən insan torpaqdan, cin isə odun şəffaf şöləsindən yarandığı üçün insan cini görə bilmir. Quran ayələrinə əsasən də, cin insan kimi mömin .(və ya kafir ola bilər. «Biz cin və insanı yalnız ibadətdən ötrü yaratdıq»(١

Allah-təalaya səcdə əmrindən boyun qaçıran İblis, əslində cin tayfasındandır. O, yalnız .ibadətcil olduğundan, mələklərlə bir cərgədə dayanmışdı

Qurani-kərimin ١١۴ surəsindən biri «Cinn» surəsidir. Bu surədə onların dilindən :buyurulur

Şübhəsiz ki, aramızda əməlisalehlər də vardır, əməlisaleh olmayanlar da. Biz müxtəlif» .(firqələrə ayırılmışıq»(٢

.(Doğrusu, biz haqq yolu göstərən Quranı dinlədiyimiz zaman, ona iman gətirdik»(٣»



---

.Zariyyat» surəsi, ayə ۵۶» [٨٨] -١
.Cinn» surəsi, ayə ١١» [٨٩] -٢
.Cinn» surəsi, ayə ١٣» [٩٠] -٣

.(Şübhəsiz ki, aramızda müsəlmanlar da var, yoldan çıxanlar da»(۱)»

Son nəticə olaraq bunu deyə bilərik ki, İblis cin tayfasından olduğundan, onun davamçısı şeytanlar da bu tayfanın iman gətirməmiş üzvlərindəndir.

## Sual ۹۱

?Sual ۹۱: İnsan meymundan yarana bilərmi

Cavab: Təbiətşünas alimlər arasında insanın yaranışı haqqında iki nəzəriyyə mövcuddur. Transformizm adlanan birinci nəzəriyyənin tərəfdarları bu fikirdədirlər ki, canlı aləm başlanğıcda bu günki formasında olmayıb. Guya ilk əvvəl okeanın müxtəlif nöqtələrindəki bir hüceyrəli bəsit cansız varlıqlar xüsusi bir şəraitdə canlı varlığa çevrilmişlər. Guya mikroskopik ölçüyə malik olan bu canlılar ilk əvvəl bir növdən digərinə, sonra sudan quruya, daha sonra isə qurudan havaya keçmişlər. Bu təkamülün son yetkin halqası isə, insandır.

İkinci nəzəriyyəyə görə isə, bütün canlılar, eləcə də insan ilk yaranışda bu günkü formasında olmuşdur. Bu baxışın tərəfdarları bütün növ dəyişiklikləri inkar edirlər.

Bu iki nəzəriyyə arasındakı mübahisələr fransız təbiətşünası Lamark (XVII-XIX əsr) və ingilis təbiətşünası Darvinin (XIX əsr) yeni sübutlarla çıxışlarından sonra daha da qızışmışdır.

Bu gün təbiətşünas alimlərin əksəriyyətinin təkamül nəzəriyyəsi tərəfdarı olduğunu nəzərə alıb, onların sübutlarını nəzərdən keçiririk.

Arxeoloji qazıntılar zamanı tapılmış müxtəlif dövrlərə aid skletlər arasındakı oxşarlıq yalnız təkamül nəzəriyyəsi ilə izah olunur. Ayrı-ayrı dövrlərə məxsus sümüklər arasında ciddi oxşarlıqlar vardır. Mühüm görünən



---

.Cinn» surəsi, ayə ۱۴» [۹۱] -۱

.sübutlardan biri isə, bütün canlıların bətndəki «cənin» formaları arasındakı oxşarlıqdır

Təkamül nəzəriyyəsi tərəfdarlarının sadaladığı bu dəlillər, «insan meymundan ?yaranmışdır» deməyə əsas verirmi

Təkamül nəzəriyyəsi, başqa sözlə, darvinizm bir dənə də olsun nə əqli, nə də təcrübi dəlilə malikdir. Bir növdə qismən dəyişiklik … mutasiya artıq təcrübi yolla qəbul olunmuşdur. Yəni cod tüklü qoyundan zərif tüklü qoyun doğula bilər. Amma meymundan insan yaranması mutasiya deyil. Bu ehtimal darvinist təbiətşünaslar .tərəfindən təcrübi sübuta yetirilmədiyindən, nəzəriyyə olaraq qalır

İslam alimləri təkamül nəzəriyyəsini inkar etmir. Amma bu nəzəriyyəni qəbul etmək !üçün zəruri olan dəlillərə də malik deyil

**Sual ۹۲**

?Sual ۹۲: Behiştdə hansı nemətlər vardır

Cavab: Qurani-kərimdə behiştin maddi və mənəvi nemətlərindən ətraflı şəkildədanışılmışdır. Səkkiz qapısı olan behiştdə, möminləri səkkiz böyük nemətin :gözlədiyi bildirilmişdir

۱. Yamyaşıl behişt bağları, göz yaşı tək duru bulaqlar;

۲. Bütün xəstəliklərdən və ağrılardan uzaq sağlamlıq;

۳. Asayiş və əmin-amanlıq;

۴. Kin-küdurətsiz, xəyanətsiz açıq ürək;

۵. Məhəbbətlə müşayiət olunan qardaşlıq;

۶. Taxtlarda üz-üzə əyləşib, kimsənin kimsəyə arxa çevirməməsi;

۷. Yorğunluq və zəhmətdən uzaq təravət;

۸. Mövcud nemətlərin əbədiliyi(۱).

Maraqlıdır ki, bütün bu nemətlər təqvalı insanlara vəd edilir. Amma bu nemətlər haqqında eşidib, öz günahlarına peşman olan insanlar da məyus edilmir. Allah-təala Qur~anda belə buyurur: «Qullarıma xəbər ver ki, Mən, həqiqətən, bağışlayan və rəhm edənəm»(١).

## Sual ٩٣

Sual ٩٣: Qurani-kərimdə zeytun, xurma və üzümün adı nə üçün xüsusi qeyd edilir?

Cavab: «Nəhl» surəsinin ١١-ci ayəsində buyurulur: «...Sizin üçün əkin, zeytun, xurma, üzüm və bütün meyvələrdən yetişdirir». Nə üçün ayədə zeytun, xurman və üzümün adı xüsusi çəkilir?

Bəziləri həmin dövrdə ərəbistanda bu meyvələrin geniş yayıldığını səbəb göstərirlər. Lakin Quran hökmləri zaman və məkanla məhdudlaşmadığından, həmin fikir qəbul edilə bilməz.

Həyatını bağçılığa sərf etmiş böyük alimlərin fikirincə, meyvələr arasında bu üç meyvə qədər qidalısı yoxdur. İnsan orqanizmi üçün zeytun yağı qədər faydalı ikinci bir yağ məlum deyil. Bu yağ orqanizmin enerji ehtiyaclarının ödənməsində olduqca mühüm rol oynayır. Əksər yüksək kalorili yağlar çətin həzm olunursa, zeytun yağı həzm prosesinə kömək edir. Həzrət Əli ibn Musa ər-Riza (ə) buyurur: «Zeytun, yaxşı qidadır. Ağızda xoş qoxu yaradır, bəlğəmi aparır, üzə təravət verir, əsəb sistemini gücləndirir, qəzəb alovunu söndürür». Bütün bu əhəmiyyətlərinə görə, Quranda zeytun «mübarək ağac» adlandırılır.

Ayədə zikr olunmuş ikinci meyvə … xurmanın tərkibi, kalsium və fosforla zəngindir. Kalsium sümükləri möhkəmləndirir, fosfor beyinin fəaliyyətini tənzimləyir.



---

١- [٩٣] «Hicr» surəsi, ayə ۴٩.

Xurma, əsəb yorğunluğunu aradan qaldırır, görmə qabiliyyətini artırır. Son dövrdə aparılan araşdırmalara əsasən, xurmanın çox yeyildiyi məntəqələrdə xərçəng .xəstəliyinə az təsadüf olunur

Üzümü «təbii əczaxana» adlandırırlar. Xüsusiyyətlərinə görə, ana südünə oxşar olan ətdən iki dəfə çox bədənin hərarətini artırır. Üzüm zəhəri təsirsizləşdirir, qanı saflaşdırır, revmatizmi aradan qaldırır və güclü mikroböldürücü təsir göstərir. Həzrət .«Peyğəmbər (s) buyurur: «Sizin üçün ən yaxşı təam çörək, ən yaxşı meyvə isə üzümdür

## Sual ۹۴

?Sual ۹۴: «Zikr əhli» kimdir

Cavab: «Nəhl» surəsində «bilmədiyinizi zikr əhlindən soruşun» buyurduğunda, kimə ?müraciət olunması nəzərdə tutulur

İmam Əli ibn Musa ər-Riza (ə) buyurur: «Zikr əhli bizik və bizdən də soruşmalısınız». İmam Baqir (ə): «Zikr Quran, zikr əhli isə, Peyğəmbərin (s) Əhli-beytidir. Onlardan da .(soruşmaq lazımdır»(۱

İbn Abbas uyğun ayənin təfsirində deyir: «Zikr əhli Məhəmməd, Əli, Fatimə, Həsən və .«Hüseyndir

Zikrin mənası agahlıq və xatırlama olduğundan, bu sözün Qurani-kərimə aid edilməsi tam məntiqəuyğundur. Quran zikr hesab olunduğu təqdirdə, Peyğəmbər (s) və onun .əhli-beytinin (ə) zikr əhli olması inkaredilməzdir

Təəccüblü də olsa, bəziləri «zikr əhli»ni «kitab əhli» kimi tərcümə etmişdir. İmam Əli ibn Musa ər-Riza (ə) «zikr əhli» ifadəsini yəhudi və məsihi alimlərinə aid edənlərə belə buyurur: «Sübhanəllah! Məgər belə bir şey mümkündürmü?! Əgər biz yəhudi və məsihi alimlərinə



---

.Nurus-səqəleyn», ۳-cü cild, səh. ۵۵» [۹۴] -۱

.(müraciət etsək, onlar bizi öz məzhəblərinə dəvət edərlər. Zikr əhli bizik!»(۱)

Yuxarıda deyilənlərdən aydın oldu ki, insan onu maraqlandıran məsələ barədə mütəxəssisə müraciət etməlidir. Hər bir şəxs öz xəstəliyinin müalicəsi üçün etibarlı həkim axtardığı kimi, dini məsələlərdə də ən ədalətli və ən alim müctehidə üz .tutmalıdır

**Sual ۹۵**

?Sual ۹۵: İslam dini qadına nə verdi

Cavab: İslamdan əvvəl təkcə cahil ərəblər arasında yox, o dövrün ən mədəni sayılan ölkələrində belə qadına bir əşya kimi baxılırdı. Sözsüz ki, ərəb cəmiyyətində qadın şəxsiyyəti daha alçaq bir şəkildə təhqir olunurdu. Cahiliyyət dövrünün məşhur :şerlərindən birində deyilirdi

,Oğullar olsa da, oğlumuz bizim

.Qızlarsa, oğludur düşmənimizin

Uyğun dövrdə tayfalararası müharibələrdə əsir düşən qadınlar, adətən, orada ərə gedər və əsirlər geri qaytarılanda düşmən tərəfdə qalmağa üstünlük verərdilər. Cahil ərəblər bu sayaq hadisələrə əsaslanaraq, yenicə doğulmuş qız övladını diri-diri .torpağa basdırardılar. İslam dininə qədərki dövrdə qadının real vəziyyəti belə idi

İslam Peyğəmbərinə (s) qızının olması xəbər veriləndə, ətrafda bu xəbəri eşidənlərin qanı qaraldı. Həzrət (s) buyurdu: «Bu nə halətdir sizdə görürəm?! Allah-təala qoxulamaq üçün mənə bir çiçək verib. Əgər onun ruzisinə görə qəmginsinizsə, ruzisini .(Allah yetirəcək»(۲)



---

.Nurus-səqəleyn», ۳-cü cild səh. ۵۷» [۹۵] -۱

.Vəsailüş-şiə», ۱۵-ci cild, səh.۱۰۴» [۹۷] -۲

Digər bir hədisdə Həzrət (s) buyurur: «Qız nə gözəl övladdır! Məhəbbətli, köməkçi, munis, pak, həm də pak edən»[1].

Həmin dövrdə qız, qadın haqqında bu sayaq sözlər demək, yalnız Allahın lütfü ilə mümkün olurdu. Peyğəmbər (s) qızı Fatimənin əlini öpəndə, hətta yaxınları belə təəccüblənərdi.

Bəli, İslam zühur etdi və qadın şəxsiyyətini alçaldan bütün ənənələrə son qoyuldu. İslam qanunları ilə yaşayan qadın, həzrət Fatimənin (ə) timsalında ən azad qadındır. İslam qadını oyuncağa, eyş-işrət vasitəsinə çevirənlərin ağzından vurub, ona şəxsiyyət azadlığı verdi.

Bu gün dünya istismarçıları qadına «hicabını at, azad ol», deyirlər. Əsil azadlıq isə bədən yox, şəxsiyyət azadlığıdır. Əgər çılpaqlıq azadlıqdırsa, heyvanlara həsəd aparmığımız gərəkdir! İslam dini isə, məhz şəxsiyyətini qorumaq üçün qadına çay daşı tək çılpaqlığı yox, qiymətli dürr kimi sədəfdə örtünməyi tövsiyə etdi. İslam «behişt ananın ayaqları altdadır» deməklə, qadını heç zaman görünməmiş bir məqama yüksəldib, ona mülkiyyət, seçib-seçilmək, ictimai-siyasi proseslərə qatılmaq hüququ verdi.

## Sual ۹۶

Sual ۹۶: Süd necə yaranır?

Cavab: İnsanın ixtiyarına verilmiş dəyərli ilahi nemətlərdən biri də süddür. Qurani-kərimdə buyurulur:



---

[۹۸]-۱ «Vəsailüş-şiə», ۱۵-ci cild, səh.۱۰۰.

Şübhəsiz ki, mal-heyvanda sizin üçün bir ibrət vardır. Biz onların qarınlarındakı qanla »
.(ifrazat arasında olan təmiz südü sizə içiririk»(١

Bətnində körpə olan ana qidalanır və bu qidaların təsiri qanda özünü büruzə verir. Qan dövranı sisteminin çıxışı, körpəni («cənin») qan dövranı sistemi ilə əlaqələnir. Körpə nə qədər ki, ana bətnindədir, bu yolla qidalanır. Uşaq doğulduqdan sonra anadakı körpəni qidalandırma çıxışı, onun döşünə ötürülür. Ananın yedikləri tam həzm olmamış bir növ qida ilə qan arasında süd yaranır. Süd nə həzm olmuş qida, nə də qandır. Ana döşündə proteinli süd hazırlanarkən, əlavə olaraq yalnız bədəndəki turşulardan istifadə olunur. Hazırlanan südün tərkibindəki vitaminlərin, duzun, fosfatın, şəkərin qandan .götürüldüyü məlumdur. Süd qida maddələrinin qan vasitəsi ilə sorulmasından yaranır

Elmi hesablamalara əsasən, ana döşündə bir litr südün hazırlanması üçün ən azı beş yüz litr qan bu üzvdən dövr etməlidir. Hansı ki, bir litr qanın yaranması üçün bu qandan qat-qat artıq qida qəbul olunmalıdır. Deməki, ana döşündə gedən proseslərin mahiyyəti, hələ də elm üçün qaranlıqdır. Həzrət Peyğəmbər (s) buyurur: «Suyu və .«qidanı tam əvəz edə biləcək yeganə şey, süddür

## Sual ٩٧

?Sual ٩٧: Allah-təala hansı həşərata vəhy nazil etdi

Cavab: «Nəhl» surəsinin ۶٨-ci ayəsində buyurulur: «Rəbbin bal arısına belə vəhy etdi: «Dağlarda, ağaclarda və alaçıqlarda (damlarda, pətəklərdə) özünə yuva sal». Növbəti :ayədə isə bu vəhyin mahiyyəti açıqlanır



---

.Nəhl» surəsi, ayə ۶۶» [٩٩] -١

.«O arıların qarınlarından insanlar üçün şəfa olan müxtəlif rəngli bal çıxar»(۱)

Maraqlıdır ki, istəklər təkcə bal arısı yox, bütün heyvanlara ilha olunduğu halda, nə üçün ayədə yalnız bal arısının adı çəkilir? Hal-hazırda bal arısının həyatının alimlər tərəfindən ətraflı şəkildə öyrənilməsi belə bir nəticəyə gəlməyə əsas verir: bal arısının ailəsindəki mədəniyyət və ictimai nizam, bəşəriyyət üçün bir nümunədir.

Bal arısının altı guşəli xanalardan ibarət qurduğu ev, hələ də mühəndisləri heyran edir. Uyğun mənzili təşkil edən xanaların altı guşəli olması ona xüsusi möhkəmlik verir. Bal arısı ailəsində çox ciddi əmək intizamı hökm sürür. Öhdəsində olan işi yerinə yetirə bilməyən üzv yuvanın qapısındakı nəzarətçilər tərəfindən geri qaytarılır. Bəs bu ciddi intizamın nəticəsi nədir? Həzrət Peyğəmbər (s) buyurur: «Hər kəs ayda bir dəfə bal yeyib, Allahdan Quranın vəd etdiyi şəfanı istəsə, Allah-təala onu ۷۷ növ xəstəlikdən qoruyar»(۲).

Ciddi nizamın və ağır zəhmətin nəticəsi olan bal, heç vaxt keyfiyyətini itirib zay olmur. Alimlərin fikirincə bunun səbəbi, balın tərkibində güclü mikroböldürücü kalsiumun çoxluğudur. Bal ürək ağrısından tutmuş mədə yarasınadək, əksər xəstəliklərin dərmanıdır.

Bal arısı və onun istehsal etdiyi bal o qədər əsrarəngizdir ki, bu mövzunun dərinliyinə getmək kitabın imkanlarından xaricdir.

### Sual ۹۸

Sual ۹۸: İnsana həqiqəti anlamaqda mane olan nədir?

səh:۸۹

---

۱- [۱۰۰] «Nəhl» surəsi, ayə ۶۹.

۲- [۱۰۱] «Səfinətül-bihar», ۲-ci cild, səh. ۱۹۰.

Cavab: Həqiqət nə qədər aşkar görünsə də, onu kor gözlə görmək mümkün deyil. Həqiqəti tanımaq üçün onun aşkar görünməsi nə qədər zəruridirsə, görən gözə də bir !?o qədər ehtiyac vardır. Axı kor, günəşin işığını necə görə bilər

İnsanın həqiqəti tanımasına mane olan yanlış mühakimələr, nəfs istəklərinə tabeçilik, kor-koranə tərəfbazlıq, təkəbbür və bu kimi başqa mənfi təzahürlərdir. Ruh .çirkləndikcə, həqiqəti dərk etmək də çətinləşir

Bir hədisdə buyurulduğuna görə, əgər şeytanlar Adəm övladının qəlbini dövrəyə almasaydılar, insanlar fəzanın dərinliklərini seyr edə bilərdilər. Bəs şeytanlardan necə qurtulmalı? Qurani-kərimdə buyurulur: «Həqiqətən iman gətirib, yalnız öz Rəbbinə təvəkkül edənlərin üzərində şeytanın heç bir hökmü yoxdur. Şeytanın hökmü yalnız .(ona itaət edib, Allaha şərik qoşanlar üzərindədir»(١

Deməк, doğru yol yolçuları üçün ilkin şərt, nəfsin paklandırılması və təqvadır. Qurani-kərim doğru yol göstərən ilahi kitab olduğu halda, nəfsinə uyan insanlar hətta Qurandan da öz yanlış mühakimələrinin sübutu üçün istifadə edirlər. Ona görə də, «Bəqərə» surəsinin ٢-ci ayəsində buyurulur: «Bu heç bir şəkk-şübhə olmayan və .«müttəqilərə doğru yol göstərən kitabdır

**Sual ٩٩**

?Sual ٩٩: Müsəlman yalan danışa bilərmi

Cavab: İstər müsəlman, istərsə də qeyri-müsəlmanlar arasında yalan ən çirkin sifətlərdən hesab olunur. Qurani-kərimdə bu barədə buyurulur: «Yalanı, ancaq Allahın .(ayələrinə inanmayanlar uydururlar. Onlar əsil yalançıdırlar»(٢



---

.Nəhl» surəsi, ayə ٩٩-١٠٠» [١٠٢] -١

.Nəhl» surəsi, ayə ١٠٥» [١٠٣] -٢

İmam Sadiq (ə) buyurur: «İnsanların rüku və səcdələrinin uzunluğuna baxmayın. Bu adət üzündən də ola bilər. Amma onların düzlüyü və etibarına diqqət edin»(1).

İmam Baqir (ə) buyurur: «Allah bütün pislikləri qıfıllayıb və şərab qıfılların açarıdır. Yalan isə, şərabdan da pisdir»(2).

Yalanla günah arasında əsaslı rabitə vardır. Günahkar insan doğru danışarsa, rüsvay olar. O öz günahını örtmək üçün yalana əl atmağa məcburdur.

Bir şəxs həzrət Peyğəmbərin (s) hüzuruna gəlib, ərz etdi: «Ya Rəsullullah! Həm namaz qılmıram, həm günaha yol verirəm, həm də yalan danışıram. Bunlardan hansını birinci tərk edim?». Həzrət Peyğəmbər (s) ona məsləhət gördü ki, əvvəlcə yalanı atsın. Peyğəmbərin (s) yanından çıxan həmin şəxs, bir az sonra günah etmək istədikdə yadına düşdü ki, Həzrətə doğru cavab verməlidir və doğru cavab verməsə, cəzalanacaq. Ona görə də bütün günahlarına tövbə etdi.

Başqa bir vaxt isə həzrət Peyğəmbərdən (s) soruşdular:

– Müsəlman qorxaq ola bilərmi?

Həzrət (s) buyurdu

– Mümkündür.

– Müsəlman paxıl ola bilərmi?

O həzrət mümkün olduğunu bildirdi.

– Müsəlman yalan danışa bilərmi?

Həzrət (s) «müsəlman yalan danışa bilməz» – deyə buyurdu.

**Sual 100**

Sual 100: Mürtəd kimdir?

Cavab: İslam dinində iman gətirdikdən sonra küfr edən insana mürtəd deyilir. Kitab əhlinə bir o qədər də sərt münasibət göstərməyən İslam, İslamı qəbul etdikdən sonra atan mürtədə olduqca kəskin yanaşır. Çünki bu böyük günah bütün İslam dünyasına .qarşı qaldırılmış qiyamdır və cəmiyyəti parçalayır

Müsəlman ata və müsəlman anadan doğulmuş bir şəxs dindən çıxarsa, onun tövbəsi zahirən qəbul deyildir. Amma valideynləri müsəlman olmayan bir şəxs dini qəbul edib .sonra dindən çıxarsa, tövbəsi qəbuldur

?Görəsən, bu iki şəxs arasında nə üçün fərq qoyulur

Əvvəlcə onu qeyd edək ki, İslam dini məntiq əsasında qəbul olunmalıdır. Müsəlman ailədə doğulmuş şəxs İslam dininin əsaslarından xəbərdar olduğu üçün onun dindən çıxması məlumatsızlıq yox, xəyanət hesab olunur. Amma dini sonradan qəbul etmiş .şəxs, bilməməzlik ucbatından səhv edə bilər

Sözsüz ki, təzyiq altında dindən çıxdığını deyən şəxs, qəlbən dinindən dönməyibsə, .mürtəd hesab olunmur

**Sual ١٠١**

?Sual ١٠١: Təbii fəlakətlərin səbəbi nədir

Cavab: Son dövrlər planetimizi bürümüş təbii fəlakətlərin səbəbi hamını maraqlandırır. Əslində isə, bu sualın cavabı olduqca sadədir. Allah-təala buyurur: «Allah bir şəhəri misal gətirir. O şəhər əmin-amanlıq və arxayınlıq içində idi. Ruzisi də hər yerdən bol-bol gəlirdi. Lakin əhalisi Allahın nemətini inkar etdi. Allah da həmin şəhərin sakinlərinə .(etdikləri əməllərə görə, aclıq və qorxu bəlası daddırdı»(١

Qurani-kərimdə Nuhu inkar edənlərin selə qərq olduğu, Ad və Səmud tayfalarının günahkarlıqları



---

.Nəhl» surəsi, ayə ١١٢» [١٠۶] -١

müqabilində dəhşətli sarsıntıya bürünərək diz üstə düşüb qaldıqları, qadınları qoyub, kişilərə şəhvətlə yanaşan Lut tayfasının əzab yağışına düçar olduğu və başqa ibrətamiz əhvalatlar rəvayət olunur. Hər bir millət Allaha etiqadı müqabilində üç böyük .nemətlə mükafatlandırılır: əmin-amanlıq, gələcəyə inam, gen-bol ruzi

İmam Sadiq (ə) buyurur: «Bəni-İsraildən bir tayfa o qədər gen-bolluq, rifah içində yaşayırdı ki, hətta uşaqlarının oyuncaqları da qida maddələrindən hazırlanmışdı. .(Amma bu tayfa axırda bir günə düşdü ki, həmin oyuncaqları yeməyə məcbur oldu»(١

Demək, bütün bəlaların, eləcə də, təbii fəlakətlərin səbəbi, «İnsanların dünyanı .(axirətdən üstün tutmasıdır»(٢

## Sual ١٠٢

?Sual ١٠٢: Müxaliflərlə necə rəftar etməli

Cavab: İnsanları doğru yola dəvət edib günahdan çəkindirmək, hər bir müsəlman üçün vacib olan dini vəzifələrdəndir. Cəmiyyətdə müəyyən mövqe seçmiş insanlar, təbii olaraq müxaliflərlə üzləşir. Bu müxaliflər sülhsevər və təcavüzkar olmaqla, iki qrupa bölünürlər. Birinci qrup müxalifətlə məntiq və əxlaqla rəftar etmək olduqca təsirlidir. «Nəhl» surəsinin ١٢٥-ci ayəsi uyğun mövzudan bəhs edir. Qurani-kərimin bir sıra başqa ayələrinə də istinad edərək, müxaliflərlə rəftar üsullarını aşağıdakı ardıcıllıqla :proqramlaşdırmaq olar

;Allahın yoluna hikmətlə dəvət et .١

Hikmət dedikdə elm, məntiq, dəlillər nəzərdə tutulur. Bu üsulla yatmış düşüncələri .oyatmaq mümkündür

;Gözəl öyüd-nəsihətlə dəvət et .٢



---

.Təfsire Nurus-səqəleyn» ٣-cü cild, səh. ٩١» [١٠٧] -١

.Nəhl» surəsi, ayə ١٠٧» [١٠٨] -٢

İnsanlar xaraktercə gözəlliyə meyilli olduqlarından, kobud şəkildə ifadə olunmuş .həqiqətə maraq göstərmirlər

;Ən gözəl şəkildə, şirin dil və mehribanlıqla dəvət et .٣

;Təcavüzkar müxaliflərlə rəftarda ədalətli ol. Artıq cəza, zülm və günahdır .۴

;Sizə cəza vermiş müxalifəti səbir edib bağışlasanız, daha yaxşıdır .۵

Ühüd döyüşündə kafirlər Peyğəmbərin (s) əmisi Həmzəni öldürməklə kifayətlənməyib, ciyərini və ürəyini çıxarmış, burnunu və qulağını kəsmişdilər. Həzrət Peyğəmbər (s) düşməndən intiqam almaq haqqında düşünərkən, ayə nazil oldu: «Əgər səbir etsəniz, .«bu, daha xeyirlidir»(١). Peyğəmbər (s) ərz etdi: «Səbir edirəm, Xudaya

;Düşmənin əzabı qarşısında səbir etmək yalnız Allaha xatir olduqda, faydalıdır .۶

.Əslində, Allahın yardımı olmadan vəhşiliyə səbir etmək, qeyri-mümkündür

;Dəvət qəbul olunmadığı təqdirdə, kədərlənmə .٧

Çünki sən öz vəzifəni yerinə yetirmisən

;Düşmən hiyləsi qarşısında sıxılıb, meydanı boş buraxma .٨

Sənin sığındığın Allah, bütün hiylələri puça çıxarmağa qadirdir

;Pis əməllərdən çəkin .٩

.Xeyir əməl üçün çalış .١٠

**Sual ١٠٣**

?Sual ١٠٣: Yəhya peyğəmbərin başı kimə hədiyyə verildi

Cavab: Allah-təala Zəkəriyya peyğəmbəri qoca yaşlarında övladla müjdələdi. «Məryəm» surəsinin ٧-ci

ayəsində buyurulur: «Ey Zəkəriyya, sənə bir oğulla müjdə veririk ki, onun adı Yəhyadır. Biz bu adı əvvəllər heç kəsə verməmişik». Uyğun surənin ١٢-ci ayəsi Yəhyanın kimliyini .«bəyan edir: «Ey Yəhya, kitabdan bərk yapış! Biz, uşaq ikən ona hikmət verdik

Yəhya peyğəmbərin ölümü də təvəllüdü kimi qeyri-adi oldu. Məsihi və müsəlman tarixçiləri bu şəhadəti belə təsvir edir: Yəhyanın yaşadığı dövrdə Fələstin padşahı nəfsinə uymuş zalım bir şəxs idi. O, öz qardaşı qızının gözəlliyinə vurulub, bu qızla evlənmək qərarına gəlmişdi. Əmisi kimi şeytana uymuş qız da, bu izdivaca çalışırdı. Bu xəbər Yəhya peyğəmbərə çatdı. Belə bir izdivacın ilahi qanunlara zidd olduğunu elan edən Yəhya, Fələstin padşahı ilə mübarizəyə başladı. Yəhyanın müxalifətçiliyindən xəbər tutan günahkar qız əmisinə dedi: «Yəhya bizim adımızı dillərə saldı. Bütün xalq .«bizdən danışır. Mən onun başından başqa hədiyyə istəmirəm

Qızın eşqindən dəli-divanə olmuş padşahın gözləri tutuldu və Yəhyanın boynunu .vurdurub, qıza hədiyyə etdi

Hədislərə əsasən imam Hüseyn (ə) buyurmuşdur: «Dünyanın pisliyinə bax! Zalımlar Zəkəriyya oğlu Yəhyanın başını Bəni-İsraildən olan günahkar bir qadına hədiyyə .«etdilər

### Sual ١٠۴

?Sual ١٠۴: Məryəm nə üçün Allahdan ölüm istədi

Cavab: Bəşəriyyət tarixində bir insan əli toxunmadan, bakirə ikən hamilə olmuş .yeganə qadın İsa peyğəmbərin (ə) anası Məryəmdir

Cahil insanların dedi-qodusundan qorxan Məryəm haqqında Qurani-kərimdə belə buyurulur: «Doğum sancısı onu bir xurma ağacının gövdəsinə söykənməyə məcbur etdi. Məryəm dedi: «Kaş ki, mən bundan əvvəl ölüb

.(qurtaraydım və ya tamamilə unudulub getmiş olaydım»(١)

Həmin qısa müddətdə üzücü çətinliklərlə üzbəüz gələn Məryəm üçün həyat zəhərə dönmüşdü. Şərəf və ləyaqətini qorumaq onun üçün heç də asan deyildi. Məryəm elə düşünürdü ki, bu uşaq doğulan kimi cəmiyyət qarşısında rüsvay olacaq. Hansı ki, Məryəm üçün paklıq həyatından üstün idi. Allahdan ölüm istəmək batil bir iş olduğu .halda, Məryəmin öz iffətini qorumağa xatir atdığı bu addım bağışlana bilərdi

Öz sevimli bəndəsini çətinliklərlə sınağa çəkən Allahın bu bəndə üçün qarşıda hansı .açılışlar hazırladığını ağlına gətirməyən insan, bəzən dözümsüzlük göstərir

Bəziləri Məryəmin başına gələnlərə şübhə edib, «Möcüzə yalnız peyğəmbərlərə və imamlara aiddir», deyirlər. Onlar unudur ki, Məryəmin başına gələnlər, bilavasitə İsa peyğəmbərlə (s) bağlı idi. Bundan əlavə, möcüzədən başqa «kəramət» deyilən bir .qeyri-adilik də var. Allah-təala istədiyi mömin bəndəni bu sifətlə mükafatlandırır

**Sual ١٠۵**

?Sual ١٠۵: Möminlər cəhənnəmi görəcəkmi

Cavab: Allah-təala buyurur: «Sizdən elə bir kəs olmaz ki, cəhənnəmə varid olmasın. Bu Rəbbinin buyurduğu vacib bir hökmdür»(٢). Əksər təfsirçilərin fikirincə, bütün insanlar .istisnasız olaraq cəhənnəmə daxil olacaqlar

Amma bu o demək deyildir ki, bütün insanlar cəhənnəm odunda yanacaqdır. ,Nəmrudun İbrahim peyğəmbəri oda atdığını xatırlayaq. Od yandırıcı olsa da



---

.Məryəm» surəsi, ayə ٢٣» [١١٠] -١

.Məryəm» surəsi, ayə ٧١» [١١١] -٢

.Allahın iradəsinə tabedir. Allahın iradəsi ilə od iman nuru qarşısında acizdir

Cəhənnəmə daxil olan möminlərin iman nuru odu təsirsizləşdirər və kimsəyə zərər toxunmaz. Həzrət Peyğəmbər (s) buyurmuşdur: «Bütün əməlisalehlər və günahkarlar cəhənnəmə daxil olar. Alov İbrahimin qarşısında hərarətdən düşdüyü kimi, möminlərin .(də qarşısında hərarətini itirər»(١

Bəs möminlərin cəhənnəmə daxil olmasının hikməti nədir? Cəhənnəmi müşahidə etdikdən sonra behiştə qədəm qoyan möminlər, onun nemətlərindən əsl ləzzət aparacaqlar. Həzrət Peyğəmbər (s) buyurur: «İnsanlar cəhənnəmə daxil olduqdan sonra əməlləri nəzərə alınmaqla, oradan bayıra çıxacaqlar. Bəziləri şimşək tək, bəziləri .(külək kimi, bəziləri iti qaçaraq, bəziləri iti yerişlə, bəziləri də adi yerişlə»(٢

Möminlərin cəhənnəmdə qalmayacaqları ayələrdə də təsdiq olunur: «Sonra biz Allahdan qorxub pis əməldən çəkinənlərə nicat verəcək, zalımları isə, orada diz üstə .(çökmüş halda saxlayacağıq»(٣

**Sual ١٠۶**

?Sual ١٠۶: Sehr xürafatdır, yoxsa həqiqət

Cavab: «Sehr» kəlməsinin lüğəti mənası, «mənbəyi bilinməyən, gizli qalan hadisə» .deməkdir. Amma hal-hazırda sehr dedikdə, qeyri-adi bir iş başa düşülür

Gözbağlayıcılıq, təlqin, yalnız mütəxəssislərə məlum fiziki və kimyəvi proseslər, .cindarlıq vasitəsi ilə nümayiş etdirilən hadisələr sehr kimi qəbul olunur



---

.Nurus-səqəleyn», ٣-cü cild səh. ٣۵٣» [١١٢] -١

.Nurus-səqəleyn», ٣-cü cild, səh.٣۵٣» [١١٣] -٢

.Məryəm» surəsi, ayə ٧٢» [١١۴] -٣

Sehrbazlıq həzrət Musanın (ə) dövründə çox güclü idi. Amma hal-hazırda da sirk .tamaşalarında sehrbazlıqla tez-tez qarşılaşırıq

Sehrbazlıqa aid yazılmış kitablarda, sehrbazların bir çox sehrləri açıqlanmışdır. Məsələn, sehrbazın əlindən hər hansı bir predmetin uçması indiki dövrdə, çətin ki, kimsəni təəcübləndirsin. Çünki insanların əksəriyyəti kimyadan xəbərdardır və bir çox maddələrin havadan yüngül olduğunu bilir. Bu maddədən hər hansı bir cismdə .yerləşdirməklə, onu hərəkətə gətirmək olar

Yuxarıda deyilənlərdən məlum olur ki, sehr inkar ediləsi xürafat deyil. Amma bu iş, adətən, insanların aldadılması üçün istifadə olunduğundan, İslam dinində qadağandır .və böyük günahlardan hesab olunur

**Sual ۱۰۷**

Sual ۱۰۷: Həzrət Peyğəmbərdən (s) sonra ümmət səhvə düçar olmuşdusa, həzrət Əli ?(ə) nə üçün susurdu

Cavab: Həzrət Əlinin (ə) ilahi məqamına şübhə edib, onu Peyğəmbərdən (s) sonrakı üç xəlifə ilə eyniləşdirənlər, həmin xəlifələrin müdafiəsinə qalxaraq deyirlər: «Əvvəlki üç .«?xəlifənin doğru yoldan azdığını bilərək, həzrət Əli (ə) nə üçün susurdu

İstər sünni, istər şiə mənbələrindən ətraflı məlumata malik insanlar, Əlinin (ə) həmin dövrdə açıq-aşkar şəkildə öz mövqeyini bəyan etməsindən xəbərdardırlar. Əmin olmaq üçün «Nəhcül-bəlağə»nin ۳, ۸۷, ۹۴, ۹۷, ۱۴۷ və ۱۵۴-cü xütbələrinə nəzər salmaq kifayətdir. Həzrət Peyğəmbərin (s) vəfatından sonra münafiqlər İslama zərbə vurmaq üçün məqam gözləyirdilər. Bütpərəstliyin kök atdığı bir ölkədə kiçik bir qatışıqlıq, dövlət sütunları kövrək olan İslam üçün çox təhlükəli idi. Həzrət Əli (ə) yalnız İslamı qorumaq xatirinə səbir edirdi. Əli (ə) öz səbri ilə müsəlmanların

birliyini qorumağa çalışmasına baxmayaraq, Əbu Bəkrə qarşı qiyama qalxdı. Ömər və .Osman isə, qətlə yetirildi

**Sual ١٠٨**

?Sual ١٠٨: Çoxallahlıq hansı dəlillərlə inkar olunur

Cavab: İslam çoxallahlığın bariz nümunəsi olan bütpərəstlik mühitində zühur etdi. İnsanların zaman-zaman etiqad etdiyi bütləri qırıb Allahın birliyinə inam yaratmaq, yalnız əsaslı dəlillər vasitəsi ilə mümkün idi. İslam məntiq və dəlillərlə bu inamı yarada .bildi

Qurani-kərimdə buyurulur: «Əgər yerdə və göydə Allahdan başqa tanrılar olsaydı, onların ikisi də pozulardı»(١). Dünyanın obyektiv nizamlı quruluşu, Allahın birliyinə ən .yetərli dəlillərdəndir

Müşriklər bu dəlil qarşısında «tanrılar bir-birinə zidd olmasa, dünyanın nizamı pozulmaz», dedilər. İslam onlara belə cavab verdi: fərq və ziddiyyəti doğuran çoxluqdur. Fərdlərin oxşarlığı eyniyyət deyil və oxşarlıq ziddiyyəti azaltsa da, tam .aradan qaldıra bilməz

Bir kafir imam Sadiqdən (ə) soruşdu: «Allah necədir?». İmam (ə) buyurdu: «Bir halda ki, yaranış nizamlıdır, ulduzlar səmada öz yolu ilə gedir, bu həmahənglik yaradanın .(birliyinə dəlildir»(٢

Qurani-kərim tərslik edib kainatın nizamını Allahın birliyinə dəlil qəbul etməyənlərə .«dəlilinizi gətirin»(٣) deyir

Əhli-beyt (ə) hədislərində məntiqə əsaslanan belə bir cavabla da rastlaşırıq: «Allahdan başqa tanrı olsaydı, o da öz peyğəmbərlərini göndərərdi. Hansı ki, bütün .«peyğəmbərlər bir Allah tərəfindən göndərildiklərini bildirmişlər



---

.Ənbiya» surəsi, ayə ٢٢» [١١٥]-١

**Sual ۱۰۹**

?Sual ۱۰۹: İnsan «tələskənlikdən» yaradılıb

Cavab: «Ənbiya» surəsinin ۳۷-ci ayəsində buyurulur: «İnsan tələskənlikdən yaradılıb». Bu ayənin «insan tələskən yaradılıb» kimi tərcümə edilməsi doğru deyildir. Ayə ərəbcə belə .«ifadə olunur: «xuliqəl-insanu min əcəlin

Təfsirçilər uyğun ayənin heç də hamıya şamil olunmadığını bildirirlər. Ayədə ilahi yoldan azmış zalım və ya cahil insanlar nəzərdə tutulur. Bu ayə bir növ təkiddir. Yəni .insan elə tələsir ki, sanki tələskənlikdən yaradılıb

Ətrafınıza diqqətlə nəzər salın. Əksər adi insanlar tələsir. İstər xeyir iş olsun, istərsə də şər iş, onlarda hövsələsizlik müşahidə olunur. Hətta günaha batmış insanlara «Allahın qəzəbinə gələrsən» deyəndə, «bəs bu əzab nə üçün gecikir»-deyə soruşurlar. Onların cavabında Allah-təala buyurur: «Ayələrimi sizə göstərəcəyəm, Məni tələsdirməyin»(۱). .Burada ayə əzab, bəla mənasında işlənmişdir

Tələskənlik insan talehi üçün o qədər təhlükəlidir ki, hətta onu əbədi axirət səadətindən məhrum edə bilər. Tələsən insan daim zərərdədir. Sürücü ötmə əməliyyatında tələsməklə həyatını əldən verir, əkinçi toxumu vaxtından əvvəl səpməklə, məhsuldan məhrum olur, insan özünə həyat yoldaşı seçərkən tələsməklə, ailə həyatını zəhərə döndərir, oruc tutan insan azanın vaxtını gözləməkdə tələsməklə, gün uzunu çəkdiyi zəhməti bada verir. Ona görə də, İslam dini öz ardıcıllarını səbrə .dəvət edir. Əksər ayələrdə səbir və namaz kəlmələri qoşa işlənir

**Sual ۱۱۰**

?Sual ۱۱۰: Bütü sındırmaq günahdırmı



---

.Ənbiya» surəsi, ayə ۳۷» [۱۱۸] -۱

Cavab: Beş ülul-əzm peyğəmbərdən biri olan İbrahimin (ə) ilahi məqamı kimsədə şübhə doğurmur. Allah-təala İbrahim haqqında buyurur: «Yadına sal ki, Rəbbi İbrahimi bir neçə sözlə imtahana çəkdiyi zaman o, Allahın əmrlərini tamamilə yerinə yetirdi. Belə olduqda, Allah ona buyurdu: «Səni insanlara imam təyin edəcəyəm»[1].

Burada İbrahimi yada salmağımız təsadüfi deyil. O, məhz büt sındırmaqla şöhrət tapmış peyğəmbərdir. Bir müddət məntiq və dəlillə ətrafındakıları bütpərəstlikdən çəkindirib, bir Allaha üz tutmağa çağıran peyğəmbər istehza ilə qarşılandı. Artıq əməli fəaliyyətə keçməyin vaxtı idi. Bütxananı xəlvət görən İbrahim (ə) vəzifəsini yerinə yetirmək qərarına gəldi.

Bayram münasibəti ilə şəhər kənarına çıxmış bütpərəstlər geri qayıdıb, bütxanaya daxil olanda, gördükləri səhnədən dəhşətə gəldilər. Sağ-salamat qoyub getdikləri bütlər, qol-qıçı sınmış halda ətrafa səpələnmişdi. Onlar «allahlarımızın başına bu oyunu kim gətirib», deyə fəryad qopardılar.

Nəhayət, təxminən ۱۶ yaşlı İbrahim (ə) tutulub, mühakimə üçün zalım Nəmrudun hüzuruna gətirildi. İbrahimin «bəlkə, bu işi böyük büt görüb» sözləri bütpərəstləri tamam çaşdırdı. Onun məqsədi, bütlərin acizliyini ətrafdakılara anlatmaq idi. Bütpərəstlər İbrahimin sözlərindən bir anlıq oyansalar da, cəhalət üstün gəldi. Nəmrudun əmri ilə İbrahim oda atıldı.

Yuxarıda deyilənlərdən aydın oldu ki, bütləri sındırmaq nəinki, günah deyil, hətta vacib bir dini vəzifədir. Bunu da unutmaq olmaz ki, büt təkcə taxtadan və ya daşdan yonulmuş heykəl deyil. İnsanı Allahdan



---

۱- [۱۱۹] «Bəqərə» surəsi, ayə ۱۲۴.

uzaqlaşdıran hər bir əşya, hər bir əyləncə, hər bir bağlılıq bütdür. Allahdan qeyrisinə .könül verib, bəndəlik məqamını unutmaq bütpərəstlikdir

**Sual ۱۱۱**

?Sual ۱۱۱: Atəşin gülzara döndüyünü görən Nəmrud iman gətirdimi

Cavab: Bütpərəstliklə fəal mübarizənin nəticəsi olaraq, zalım padşah Nəmrud İbrahimi odda yandırmaq qərarına gəldi. Zalım istismarçılar, adətən, avam kütlələrin qəlbini ələ almaq üsullarını gözəl bilirlər. Nəmrud da belələrindən idi. O, «hanı sizin qeyrətiniz», «nə üçün tanrılarınızı müdafiə etmirsiniz», «qeyrətiniz varsa, İbrahimi oda çəkin» kimi şüarlarla xalqı İbrahimə qarşı qaldırdı. Camaat tonqal üçün qırx gün çır-çırpı daşıdı. Tonqal qalandıqdan sonra ətrafında elə bir hərarət yarandı ki, kimsə yaxınlaşa bilmədi. Çox düşündükdən sonra qərara gəldilər ki, İbrahimi mancanağa qoyub, əzəmətli tonqalın içinə atsınlar. Belə də etdilər. Allah-təala buyurur: «Biz də «ey atəş, .(İbrahimə qarşı sərin və zərərsiz ol» buyurduq»(۱

Əl-mizan»da nəql olunan bir rəvayətə görə Cəbrail (ə) İbrahimin (ə) görüşünə gəlib,» dedi: «Köməyə ehtiyacın varmı?». İbrahim (ə) belə cavab verdi: «Sənin köməyinə yox!». Cəbrail ona belə təklif etdi: «Onda Allahdan kömək istə». Həzrət İbrahim dedi: «Hamıdan .«!xəbərdar olması kifayətdir

Bütpərəstlər İbrahimi atdıqları odun vahiməsindən fəryad çəkir, Nəmrud isə İbrahimin bir ovuc külə dönəcəyi anı həsrətlə gözləyirdi. Amma tonqal yanıb tükəndikdən sonra İbrahimin sağ-salamat onunla üzbəüz dayandığını görən Nəmrud haray çəkib dedi: «Ey İbrahim! Doğrudan da, sənin Allahın böyük imiş. Səninlə od arasında pərdə



---

.Ənbiya» surəsi, ayə ۶۹» [۱۲۰] -۱

.«çəkəcək qədər böyük! İndi ki, belə oldu, O Allahın qüdrətinə xatir qurbanlıq edirəm

Rəvayətə görə, Nəmrud dörd min qurban kəsdi. Amma İbrahim ona xatırladı ki, bütpərəstlikdən imtina edib, bir Allaha iman gətirməsə, qurbanları qəbul olmayacaq. Nəmrud isə ona belə cavab verdi: «Belə etsəm, taxt-tacım əlimdən çıxar. Mən isə buna .«dözə bilmərəm

**Sual ١١٢**

?Sual ١١٢: Bir mühakimədə iki hökm ola bilərmi

Cavab: «Ənbiya» surəsinin ٧٨-ci ayəsində xarab edilmiş əkin sahəsinə işarə olunur. Dini .rəvayətlərdə isə, bu hadisə ətraflı şərh olunur

Bu hadisə cərəyan edən vaxt uşaq olan Süleyman, atasına yaxınlaşıb deyir: «Ey Allahın peyğəmbəri, bu hökmü əvəz etsən yaxşıdır. Bağı, bərpa edilənədək qoyunların sahibinə tapşır. Qoyunları isə bağ sahibinə ver ki, bağ bərpa olanadək, südündən .(yunundan istifadə etsin»(١

Məlumatsızlıq üzündən cahil insanlar elə düşünə bilər ki, uyğun əhvalatda haqqında danışılan iki hökm bir-birinə ziddir. Hansı ki, bir çətinlikdən iki çıxış yolu ola bildiyi kimi, .bir mühakimədə də iki müxtəlif hökm verilə bilər

Davud peyğəmbər bağ sahibinə dəymiş zərəri hesablayaraq, bu zərərin qoyunlarla ödənməsi hökmünü vermişdi. Bu hökm tam ədalətli idi. Oğlu Süleymanın verdiyi hökm .də ədalətə əsaslanırdı



---

.«Məcməul-bəyan» [١٢١] -١

Belə bir hadisənin baş verməsinin hikməti nə idi? «Təfsiri-Safi»də nəql olunur ki, imam Sadiq (ə) buyurmuşdur: «Bu macəra Davud peyğəmbərin canişininin təyini ilə bağlı idi». Hədisdən belə məlum olur ki, uyğun mühakimədə Süleymanın istedadını açıqlanmaqla, onun qarşıdakı peyğəmbərlik məqamına işarə olunurdu.

**Sual ۱۱۳**

Sual ۱۱۳: Nə üçün səbirdən danışılanda «Əyyubun səbri» məsəl çəkilir?

Cavab: Allah-təala öz peyğəmbəri barədə buyurur: «Əyyubu yada sal. Bir vaxt o, Rəbbinə dua edərək belə demişdi: «Mənə bəla üz verdi. Sən rəhimlilərin rəhimlisisən»(۱).

İmam Sadiqdən (ə) Əyyubu ağuşuna almış bəlaların səbəbi haqqında soruşulanda, Həzrət buyurdu: «Əyyuba üz vermiş bəlaların səbəbi, onun ilahi nemətlər qarşısında çox şükr etməsi idi. Əyyubun imanına həsəd aparan İblis, onun çox şükr etməsini nemətə qərq olması ilə əlaqləndirmişdi. O, Allah dərgahına belə ərz etmişdi: «Sən Əyyubdan dünya nemətlərini alsan, görərsən ki, o şükr edənlərdən deyil. Mənə icazə ver, sübut edim ki, dediklərim doğrudur».

Bu əhvalatı bütün həqiqətsevərlər üçün dəlil olsun deyə, Allah-təala İblisə icazə verdi, İblis əvvəlcə Əyyubun var-dövlətini, sonra övladlarını əlindən çıxardı. Lakin bu hadisələr Əyyubun şükrünü daha da artırdı. Daha sonra Əyyubu xəstəliyə düçar edib, hey-hərəkətini əlindən aldı. Lakin Əyyub şükrünü davam etdirirdi. İblis bu böyük insanın iradəsini qırmaq üçün hücumlarını şiddətləndirdi. Ətrafdakıların «axı nə günah etmisən ki, belə bəlaya düşmüsən» kimi qınaqları Əyyubun qəlbini parçalayırdı.



---

۱- [۱۲۲] «Ənbiya» surəsi, ayə ۸۳.

Amma misilsiz bəlalar qarşısında Əyyub son nəfəsədək şükründən əl çəkmədi. Beləcə, .«Əyyub səbri» zərbi-məsələ çevrildi

**Sual ۱۱۴**

?Sual ۱۱۴: Həddi aşmış ümməti tərk etmək olarmı

Cavab: «Ənkəbut» surəsinin ۵۶-cı ayəsində buyurulur: «Ey iman gətirmiş bəndələrim, (sizi incidib, əziyyət verilərsə, hicrət edə bilərsiniz) şübhəsiz ki, mənim yerim genişdir. Buna görə də, yalnız mənə ibadət edin». Ayədən məlum olur ki, həddi aşmış ümmətin .təzyiqləri dini vəzifələrin icrasına mane olursa, başqa bir yerə hicrət etmək lazımdır

Amma unutmaq olmaz ki, adi insanlarla peyğəmbərlərin vəzifələri arasında fərqlər mövcuddur. Peyğəmbərlər yalnız vəhy əsasında hicrət edir və bir yerdən başqa yerə köçməklə, ilahi buyuruğa əməl edirlər. İbrahim (ə), Musa (ə) və həzrət Məhəmmədin .(s) hicrəti bu qəbildəndir

Lakin həddi aşmış ümmətini tərk edən Yunis peyğəmbər haqqında belə buyurulur: «Bir zaman o qəzəblənərək çıxıb getmiş və onu möhnətə düçar etməyəcəyimizi güman ?etmişdi»(۱). Ayədə zikr olunmuş macəra nə ilə nəticələnir

İraqın Neynəva məntəqəsində uzun illər qövmünü tək Allaha itaətə çağıran Yunis peyğəmbər, onların etinasızlığı ilə qarşılaşır. Bu qövmün inadkarlığından bezərək, məntəqəni tərk edir. Yunisin süvar olduğu gəmi yolda tufana düşür. Gəminin kapitanı bu hadisəni gəmidə fərari olması ilə əlaqələndirib, bir neçə dəfə püşk atır. Hər dəfə püşk Yunisə düşdüyündən, onun fərari olması kimsədə şübhə doğurmur. Nəhayət, bəladan qurtulmaq üçün Yunis



---

.Ənbiya» surəsi, ayə ۸۷» [۱۲۳] -۱

dənizə atılır. Böyük dəniz nəhənginin udduğu Yunis, Allahın möcüzəsi ilə sağ qalır. .Allahın qəzəbinə səbəb olduğunu anlayan Yunisin duası qəbul olur

Bu hadisə bir daha sübut edir ki, adi insanlar üçün xəta hesab olunmayan bir iş, peyğəmbərləri çətinliyə sala bilər. Nə Adəm, nə də Yunis peyğəmbər heç bir günaha .yol verməmişdilər. Sadəcə, daha xeyirli əməli tərk etmişdilər

**Sual ۱۱۵**

?Sual ۱۱۵: Bütün anaların öz övladlarını unudacağı gün hansı gündür

Cavab: Allah-təala dünya həyatının sona yetməsi ilə bərpa olacaq qiyamət günü haqqında buyurur: «Ey insanlar, Rəbbinizdən qorxun! Həqiqətən, qiyamət gününün zəlzələsi dəhşətli şeydir. Onu görəcəyiniz gün, hər bir əmzikli ana südəmər körpəsini unudar, hər bir hamilə qadın bari-həmlini yerə qoyar. İnsanları məst görərsən. Hansı .(ki, onlar məst deyil, Allahın əzabı şiddətlidir»(۱

Bəziləri Allah qorxusu ilə adi həyat hadisələrindən qorxuya eyni səviyyədə yanaşır və Allah qorxusunu, insan şəxsiyyəti üçün nöqsan hesab edirlər. Həqiqətən də, insanın gecənin qaranlığından, ölümündən qorxması onun şəxsiyyəti üçün qəbahətdir. Lakin insanın Allahdan qorxması onun şəxsiyyətinə nöqsan yox, ucalıq gətirir. Zalım bir hakimdən qorxu insanı xəyanətə, ədalətsizliyə sövq etdiyi halda, Allah qorxusu insanda yalnız müqəddəs hisslər doğurur. Ölümdən qorxan insan, dünyanı əldən verməmək üçün vətənini də satmağa hazır olduğu halda, Allahdan qorxan insan, Onun .qəzəbinə düçar olmamaq üçün dünya həyatını qurban verir



---

.Həcc» surəsi, ayə ۱-۲» [۱۲۴] -۱

İnsan xarakterinin malik olduğu bütün hisslər, iki istiqamətdə işlənir. Qorxu da xarakterin malik olduğu hisslərdəndir. Onun işlənməsi qeyri-mümkündür. Sual olunur: !?Əgər Allahdan qorxmaq qəbahətdirsə, bəs nədən qorxmaq fəzilətlidir

İnsanda qorxu hissi mövcuddur və yalnız Allah qorxusu fəzilət hesab oluna bilər. Bəs dəhşətli qiyamət zəlzələsi zamanı qorxmamaq mümkündürmü? Bu qorxu fəzilətdir, ?yoxsa qəbahət

Bu suala cavab vermək üçün dünya həyatımızda baş verən zəlzələləri xatırlamaq ?lazım gəlir. Qorxunu qəbahət hesab edənlər bu zəlzələlər zamanı özünü necə aparır

Bir sözlə, qorxu mövcuddur və insanda müsbət hisslər aşılayan, onu Allaha yaxınlaşdıran, günahın qarşısını alan qorxu qəbahət deyildir. Qorxunun məhz müsbət təsirlərini düşünərək, qiyamət gününü ... dəhşətli zəlzələlərlə müşayiət olunan günü unutmamağımız zəruridir. Bir gün ki, bütün əmzikli analar südəmər körpəsini !unudacaq

**Sual ۱۱۶**

?Sual ۱۱۶: İnsan həyatı hansı mərhələlərdən ibarətdir

Cavab: «Həcc» surəsinin ۵-ci ayəsində buyurulur: «Həqiqətən, biz sizi torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan, sonra tam şəklə düşmüş və ya düşməmiş «muzğə»dən (çeynənmiş ətə oxşar şey) yaratdıq ki, sizə göstərək. İstədiyimizi ana bətnində bir müddət saxlar, sonra uşaq şəklində doğurarıq. Sonra məqsəd yetkinlik həddinə çatmağınızdadır. Bu arada kimi ölər, kimi də ömrün elə rəzil həddinə çatar ki, .«bildiklərini unudar

:Ayədən göründüyü kimi, insan həyatı yeddi mərhələdən ibarətdir

۱. Torpaq mərhələsi – yalnız Adəm yox, bütün insanların ilki topaqdır. Ata-ananın qidalandığı bütün nemətlər torpaqdan yaranır və ana bətnində nütfə şəklinə düşür.

۲. Nütfə mərhələsi – nütfə torpağın qidalarla ata-ana orqanizminə ötürdüyü mikrocanlı qatqıdır.

۳. Ələqə mərhələsi - ələqə, növbəti laxtalanmış qan mərhələsidir.

۴. Muzğə mərhələsi – laxtalanmış qanın əvvəlcə çeynənmiş ətə oxşar formaya düşməsi və qəfildə əzaların formalaşması.

۵. Uşaqlıq mərhələsi.

۶. Yetkinlik mərhələsi.

۷. Qocalıq mərhələsi.

### Sual ۱۱۷

Sual ۱۱۷: «Ərzəlil-umur» nədir?

Cavab: «Ərzəlil-umur» deməklə, Qurani-kərimdə ömrün ən rəzil dövrü nəzərdə tutulur. Bu, qocalığın elə bir dövrüdür ki, insan bütün biliklərini yaddan çıxarır. Onun biliyi, qarşıya çıxan işlərdə tədbiri eynən uşağı xatırladır. Uşaq kimi xırda bir məsələyə görə narahat olur, bir anda həm sevinir, həm hövsələdən çıxır. Hətta hərəkətləri də uşaq hərəkətlərinə bənzəyir. Hansı ki, uşaqdan heç nə gözləməyənlər ondan çox şey gözləyir. Uşaq yaşa dolduqca dəyişiləcəyinə ümid olduğu halda, qocadan belə bir intizar yoxdur. Uşaqla qoca arasındakı fərqlərdən biri budur ki, uşağın itiriləsi bir şeyi olmadığı halda, qoca ömrünün bütün sərmayəsini əldən vermişdir. Bütün bu xüsusiyyətləri nəzərə alanda uşağa nisbətən qocanın halı daha acınacaqlı görünür.

səh:۱۰۸

.(Bəzi rəvayətlərdə «ərzəlil-umur» yüz yaşdan yuxarıya aid edilir(۱

Bu deyilənlər bütün qocalaramı aiddir? Ətrafımıza diqqətlə nəzər salsaq görərik ki, bu hala ömrünü elmi mübahisələrdə keçirmiş alimlər arasında çox az təsadüf olunur. Amma belə bir halın Quranda xatırladılması düşünən insanlar üçün ciddi bir .xəbərdarlıqdır. Ömrümüzün belə bir dövrünün çətinliklərindən Allaha pənah aparaq

**Sual ۱۱۸**

?Sual ۱۱۸: Allahın qurbanlığa ehtiyacı varmı

Cavab: Bəşər tarixində qurbanlıq haqqında ilkin məlumatla Adəm peyğəmbərin iki oğlunun əhvalatında rastlaşırıq. «Onlar qurban gətirdikləri zaman birinin qurbanı qəbul edilmiş, digərinin isə qəbul olunmamışdır»(۲). Bütün səmavi kitablarda, eləcə də, Qurani-kərimdə ilahi hədlər gözlənilməklə, Allah yolunda qurban kəsilməsi alqışlanılır. Lakin cəhalət üzündən bütün işlərdə ifrata varan insanlar, bu işdə də günaha yol vermişlər. Onlar ibadət üçün xəlq olunmuş insan övladını qurbanlıq etməkdən belə çəkinmişlər. Belələri, təbii ki, Allahın qəzəbinə düçar olmuşlar. Allah-təala İbrahim peyğəmbərə (ə) oğlu İsmayıli qurbanlıq etməsi üçün göstəriş verdiyi halda, İbrahimin əlində bıçağın kütləşməsi, Allahın qurbanlıq üçün qoyun göndərməsi, bir daha vəhşi .adətlərin süqutudur

Allahın qurbanlığa ehtiyacı varmı? Cism olmayan ehtiyacsız Allah belə buyurur: ,«Onların nə əti, nə də qanı



---

.Təfsiri Nurus-səqəleyn», ۳-cü cild, səh. ۴۷۲» [۱۲۵] -۱

.Maidə» surəsi, ayə ۲۷» [۱۲۶] -۲

.(əlbətdə, Allaha çatmaz. Allaha çatacaq olan, yalnız sizin təqvanızdır»(۱)

Qurban kəsmək ibadətdir. Bütün ibadətlərin əsas hədəfi, kamil insan tərbiyəsidir. .Qurban kəsən insan fədakarlıq məktəbi keçərək, şəhadət üçün hazırlıq görür

.Qurbanlığın digər bir əhəmiyyəti də, fəqir və miskinlərin yada salınmasıdır

## Sual ۱۱۹

?Sual ۱۱۹: Qəlbdə həqiqətə şübhə doğuran kimdir

Cavab: Batilə arxa çevirib, həqiqətə üz tutan insan şeytanın hədəfinə çevrilir. «O şeytan ki, insanların ürəklərinə vəsvəsə salır»(۲). Quran ayələrindən məlum olur ki, bu vəsvəsələrdən kimsə suğortalanmamışdır: «(Ya Məhəmməd) Səndən əvvəl də elə bir rəsul, elə bir nəbi göndərmədik ki, şeytan onun arzu-diləyinə bir xələl qatmasın. Lakin .(Allah şeytanın vəsvəsəsini batil edər»(۳

Lakin şeytanın insana təlqini cavabsız da qala bilər. Agah və imanlı insanların həqiqəti batildən seçməkdə heç bir çətinliyi yoxdur. Quran oxuyan insanın qəlbində nüfuz edib ayələrə şübhə doğuran şeytan, daim iki münasibətlə üz-üzədir: o, agah və imanlı .insandan rədd cavabı alır, cahil insanları tovlamağa nail olur

İslam düşmənləri şeytanın nüfuzunu təsdiq edən ayələrdən sui-istifadə edərək, hətta həzrət Peyğəmbərin (s) də tovlandığını iddia edirlər. Bu müddəaya da yalnız avamlar inana bilər. Əgər şeytan agah və imanlı adi insanı aldada bilmirsə, daim ilahi göstərişlərdən faydalanan Peyğəmbəri necə aldada bilər?! (Xatırladaq ki, Adəmlə şeytanın əhvalatında Adəm günaha yol verməmişdi. Sadəcə, yaxşı bir iş tərk .(olunmuşdu



---

.Həcc» surəsi, ayə ۳۷» [۱۲۷] -۱

.Nas» surəsi, ayə ۵» [۱۲۸] -۲

.Həcc» surəsi, ayə ۵۲» [۱۲۹] -۳

## Sual ١٢٠

?Sual ١٢٠: «Xuşu» nədir

Cavab: İnsanın hər hansı bir sahədə çalışması, hələ müvəffəqiyyət deyildir. Hədəfə doğru aparan yolda maneələr mövcuddur və bu maneələri dəf etmədən hansı !?müvəffəqiyyətdən danışmaq olar

İnsanın nəfs istəkləri ilə mübarizəsi, ömrün sonunadək davam edən müharibəni xatırladır. Müharibə meydanına girmək, hələ qələbə çalmaq deyildir. Namaza başlamış insan döyüşə girmiş cəngavəri xatırladır. O, yalnız özünün və düşməninin qüvvəsini düzgün qiymətləndirib, Allahın yardımı və öhdəsindəki imkanlardan tam istifadə etməklə qalib gələ bilər. Namaza başlamasına baxmayaraq, pis vərdişlərdən əl çəkməyən, dini cəmiyyətlərin adına ləkə gətirən insanlara az təsadüf olunmur. «Möminun» surəsinin ١ və ٢-ci ayələrində buyurulur: «Möminlər nicat tapdılar. O .«möminlər ki, namazlarında xuşu vardır

Xuşu nədir? Xuşu insanın hər hansı əzəmət və ya həqiqət qarşısında təvazökarlığı, özünü kiçik tutmasıdır. Qurani-kərimdə namaza başlamaq yox, xuşu halında namaz .qılmaq möminlik əlaməti hesab olunur

Məcməul-bəyan»ın təfsirində belə bir hədis nəql olunur: «İslam Peyğəmbəri (s) namaz » zamanı bəzən göyə nəzər salardı. Yuxarıdakı ayə nazil olandan sonra bir daha başını .«qaldırmadı. Daim yerə baxdı

Doğrudan da, zorlu bir zalım qarşısında məzlum görkəm alan insan, necə ola bilər ki, Allah qarşısında özünü kiçik tutmasın?! Xuşu kimi vacib bir hal necə əldə oluna bilər? Ayə və hədislərin köməyi ilə, bu işdə müvəffəq olmaq istəyənlərə yeddi məsləhət :verilir

Mütaliə və düşüncə vasitəsi ilə Allahın böyüklüyünü, dünyanın kiçikliyini anlamağa .١ ;çalışmaq

İnsanın fikirini daim özünə cəlb edən səmərsiz məşğələlər, əyləncələrdən . ۲ ;kənarlaşmaq

;Bəzək-düzəksiz, sadə yerdə namaz qılmaq .۳

;Günahdan uzaq olmaq .۴

;Namazın mətninin mənası və fəlsəfəsini öyrənmək .۵

;Namazda müstəhəbb əməlləri yerinə yetirmək .۶

.Namazda xuşunun şərt olunduğunu unutmamaq .۷

**Sual ۱۲۱**

?Sual ۱۲۱: Bər-bəzəkli yaşayışın imana təsiri varmı

Cavab: Allah-təala Qurani-kərimin müxtəlif ayələrində insanı ibadət üçün xəlq etdiyini buyurur. Bu da aydındır ki, qəlbdə Allah sevgisi olmadan əyilib-düzəlməyin heç bir faydası yoxdur. Qur´anda bu barədə buyurulur: «Vay halına o namaz qılanların ki, .(onlar öz namazlarından qafildirlər»(۱

Bir anlıq özünüzü cərrahiyyə otağında hiss edin. Bu otaqda telefon, televizor, divarda şəkil, yerdə rəngarəng xalı-xalça gözə dəymir. Burada insanın diqqətini əməliyyatdan yayındırası heç nə yoxdur. Çünki bu otaqda insanın ilahi talehi həll olunur. Bir .əməliyyatçının fikir dağınıqlığı, insan həyatına son qoya bilər

Əgər Allah-təala ibadət üçün xəlq etmiş və fikir dağınıqlığı ibadəti puça çıxarırsa, .demək, insan eynən cərrahiyyə otağındakı sadə mühitdə ibadət etməlidir

Bəs qalan vaxtlar necə, Allahı unutmaq olarmı? Bər-bəzəkli həyat insan düşüncəsini Allaha yaxınlaşdırır, yoxsa uzaqlaşdırır? «Möminun» surəsinin ۳۳-cü ayəsindən məlum olur ki, kübar həyat tərzi iman yolunda ciddi maneələrdəndir: «Tayfasının kafir olan, axirətə qovuşacaqlarını yalan hesab edən və dünyada nemət

.«...verdiyimiz əyan-əşrəfi dedilər: «Bu sizin kimi adi bir insandır

Bər-bəzəkli gün-güzəran qurmaq, başqalarının haqqını qəsb etmədən mümkün olmur. Dünyada böyük var-dövlət qazanmaq üçün əksər hallarda peyğəmbərləri və onların buyuruqlarını inkar etməkdən başqa yol yoxdur. Baxın ətrafa. Kübar həyat tərzi keçirənləri necə görürsünüz? Cəmiyyətdə spirtli içkiləri, əxlaqsızlığı, sələmçiliyi və !?başqa min bir fəsadı törədən həmin təbəqə deyilmi

**Sual ۱۲۲**

?Sual ۱۲۲: Nə üçün insanların əksəriyyəti həqiqəti xoşlamır

Cavab: Ola bilsin ki, bu mövqeyə etiraz edənlər tapıla. Axı ən qəddar cinayətkarlar da, .həqiqəti sevdiklərini iddia edirlər. Burada iki mühüm nöqtəni qeyd etmək zəruridir

Əvvəla, həqiqəti dildə, başqa sözlə sözdə qəbul etmək hələ həqiqəti sevmək deyildir. Həqiqətə bağlılıq əməldə sübut olunmalıdır. Həqiqəti sevən insan, bu həqiqət onun zərərinə olsa belə, etiraz etməz. Amma sözdə həqiqətdən dəm vuranlar, həqiqət .onlara qarşı olduqda bəhanəyə əl atarlar

İkincisi, bəziləri elə güman edirlər ki, həqiqət nisbi anlayışdır. Amma əslində Allah bir olduğu kimi, həqiqət də birdir. Əgər bir tayfa müsəlman, o biri tayfa bütpərəstdirsə, bu o demək deyil ki, həqiqi din ikidir. Əgər nəzərə alsaq ki, dünyada yalnız bir həqiqi din mövcuddur, aydınlaşar ki, bəşəriyyətin böyük bir hissəsi həqiqətdən uzaqdır. Bu :barədə Qur´anda belə buyurulur

Peyğəmbər onlara haqq olan Quranla gəldi. Lakin onların əksəriyyəti haqqı...» .(xoşlamır»(۱

.(İnsanların əksəriyyəti şükr edən deyil»(۲»

.(İnsanların əksəri iman gətirməz»(۳»

.(İnsanların əksəri bilməz»(۴»

Bu ayələr uyğun məsələyə Quranın münasibətini açıq-aşkar bəyan edir. Bəs nə üçün əksəriyyət haqqı xoşlamır? Cavab olduqca sadədir: Allahdan çəkinməyib, dünya !istəklərinə uyan insan, həqiqətə təslim olmaq iqtidarında deyildir

## Sual ۱۲۳

?Sual ۱۲۳: Hal-hazırda ölənlərin məskəni haradadır

Cavab: Qiyamət günü Adəmdən bu yana bütün ölənlərin dirilib, qiyamət sorğusuna çəkiləcəyini, kiminin behiştə, kimininsə cəhənnəmə sakin olacağını bilirik. Bəs, hal-hazırda dünyadan köçənlər qiyamət gününədək harada gözləyir? Qurani-kərimdə buyurulur: «(Ölənlər geri qayıda bilməz) onların qarşısındakı qaldırılacaq günədək .(aralıq (bərzəx) vardır»(۵

Qiyamət qopan anadək ölənlərin müvəqqəti yerləşdiyi məskən ərəbcə «bərzəx» adlandırılmışdır. Bu sözün lüğəti mənası, «iki şey arasında yerləşən»dir. Ayə və hədislər .dünya və axirət arasında belə bir aləmin olduğunu təsdiq edir

İmam Sadiq (ə) buyurur: «Bərzəx, dünya və axirət arasında mükafat və cəza verilən qəbr aləmidir. And



---

.Möminun» surəsi, ayə ۷۰» [۱۳۱] -۱

.Bəqərə» surəsi, ayə ۲۴۳» [۱۳۲] -۲

.Hud» surəsi, ayə ۱۷» [۱۳۳] -۳

.Əraf» surəsi, ayə ۱۸۷» [۱۳۴] -۴

.(olsun Allaha, yalnız sizin bərzəx dünyanız üçün qorxuruq»(١)

Bəzi rəvayətlərdə insanlar xalis mömin, xalis kafir və orta vəziyyətdə olmaqla, üç qrupa bölünürlər. Xalis möminlər bərzəx behiştinə, xalis kafirlər bərzəx cəhənnəminə gedirsə, üçüncü qrup mənsub insanlar bərzəxdən qəflət içində keçirlər.

### Sual ١٢۴

?Sual ١٢۴: Qiyamət sorğusunda peyğəmbər nəslindən olmağın faydası varmı

Cavab: İslam peyğəmbəri həzrət Məhəmmədin (s) layiqli nəvəsi dördüncü imam Zeynəl-Abidin (ə) buyurur: «Allah-təala behişti, Həbəşi qul da olmuş olsa, Ona itaət edən saleh əməl sahibləri üçün yaradıb. Cəhənnəmi isə, Qüreyş övladı da olmuş olsa, .(Ona itaətdən boyun qaçıranlar üçün xəlq edib»(٢)

Möminun» surəsinin ١٠١-ci ayəsində buyurulur: «Sur çalındığı gün, artıq onların» .«arasında heç bir qohumluq əlaqəsi qalmaz və bir-birlərindən kömək istəməzlər

Ravilərdən biri belə nəql edir: «Aylı bir gecədə Allah evini təvaf edərkən, könül oxşayan gözəl və qəmli bir səs eşitdim. Göz gəzdirəndə üzündən nur yağan bir gəncin Kəbə pərdəsindən tutub, dua etdiyini gördüm. O, deyirdi: «Ey mənim böyüyüm, ey mənim ağam! Bəndələrinin gözünü yuxu aparıb, ulduzlar bir-birinin ardınca məğrib üfüqlərində gözdən itir. Sən isə oyaqsan, ətrafında heç zaman yuxu dolanmaz. Bu gecə yarısı padşahlar qapısını bağlamış, dostlar bir-birindən ayrılmışdır. Ehtiyaclıların üzünə açıq qalan bircə sənin qapındır. Qapına gəlmişəm, xətakaram. Bağışlanmağa ümidlə gəlmişəm! Lütf nəzərinin



---

١- [١٣۶] «Təfsiri Nurus-səqələyn», ٢-ci cild, səh. ۵۵٣.

٢- [١٣٧] «Təfsiri Nurus-səqələyn», ٣-cü cild, səh. ۵۶۴.

.istəyi ilə gəlmişəm!». Onu tanıdım. Bu, imam Zeynəl-Abidin (ə) idi

Yaxınlaşıb dedim: «Ey peyğəmbər balası, sizin haqqınızda təthir ayəsi nazil olub. Bu göz yaşları nədir?». İmam (ə) buyurdu: «Allah-təala behişti itəaətkar bəndələr, cəhənnəmi isə asilər üçün yaradıb. Qiyamət sorğusunda Həbəşi qul, ya Qüreyş başçısı olmağın .«heç bir fərqi yoxdur

## Sual ۱۲۵

?Sual ۱۲۵: Yer üzündə neçə il qaldınız

Cavab: Allah-təala qiyamət günü kafirlərdən soruşar: «Yer üzündə neçə il qaldınız?» .(Onlar cavab verər: «Bir gün, yaxud bir gündən də az»(۱

Həqiqətən, axirət həyatı ilə müqayisədə dünya həyatı olduqca qısadır. Lakin nəfs istəklərinə uyub, dünyanın bər-bəzəyinə baş qatan insan, bu dünyada əbədi .yaşayacağını zənn edir. Agah və imanlı insanlar isə, heç zaman belə düşünmür

Həzrət Peyğəmbər (s) buyurur: «Dünyanın şirinliyi axirətin acılığı, dünyanın acılığı axirətin şirinliyidir». Başqa bir hədisdə buyurulur: «Bütün xətaların başlanğıcı dünya .«sevgisidir

Həzrət Əli (ə) buyurur: «Qəlbini dünya məhəbbəti tutmuş şəxs, Allah sevgisində iddialı .«ola bilməz

.«Başqa bir hədisdə belə buyurur: «Ən böyük günah, dünya sevgisidir

illik bir ömrün cəmi ۶۱۴۸۸۰ saatdır olduğunu nəzərə alsaq, dünya həyatını əyləcədə ۷۰ keçirməyin nəticəsi aydın olar: qiyamət günündə üzücü təəssüf və gecikmiş yalvarışlar!: «Ey Rəbbimiz, bizi cəhənnəm odundan



---

.Möminun» surəsi, ayə ۱۱۲-۱۱۳» [۱۳۸] -۱

.(çıxar! Əgər bir də pis işlərə qayıtsaq, şübhəsiz ki, zalım olarıq»(۱

**Sual ۱۲۶**

?Sual ۱۲۶: İsmətli qadına zina isnad etməyin cəzası nədir

Cavab: İslam dinində böyük günahlardan biri də, böhtandır. Allah-təala iman gətirmiş bəndələri birliyə çağırır və müsəlman cəmiyyətini parçalayan bütün əməlləri ittiham edir. Cəmiyyətdəki nizamı pozan, hakimləri ədalətsiz qərarlar çıxarmağa sövq edən .böhtançılar üçün ciddi cəzalar nəzərdə tutulur

Bəzi böhtan söz çərçivəsindən çıxıb, günahsız insanların bədbəxtçiliyinə səbəb olur. Əksər cəmiyyətlərdə təsadüf olunan yalançı şahidləri gözünüz önünə gətirin. Onlar öz çirkin nəfs istəklərini həyata keçirmək üçün kimə gəldi böhtan yağdırır, günahsız .insanların cəzalandırılmasından zövq alırlar

Cəmiyyətdə insanların xoşbəxt həyatına əngəl törədən, onların əxlaqına təcavüz edən qruplardan biri də, zinakarlardır. Qeyri-qanuni cinsi əlaqə, bəşəriyyətin genefondunu zəhərləyən bir təzahürdür. İslam dinində zinakarlara qarşı ilahi həddlər müəyyənləşdirilmişdir. Lakin zinakarlığı iddia olunan insan, heç də həmişə deyildiyi kimi olmur. Mütləq ədalətə əsaslanan İslam, zinakar qadınlarla barışmaz olduğu qədər, ismətli qadınların da iffətini müqəddəs tutur. Qurani-kərimdə buyurulur: «İsmətli qadınlara zina isnad edib, sonra dörd şahid gətirə bilməyən şəxslərə səksən .(çubuq vurun...»(۲

səh:۱۱۷

---

.Möminun» surəsi, ayə ۱۰۷» [۱۳۹] -۱

.Nur» surəsi, ayə ۴» [۱۴۰] -۲

İsmətli qadınlara böhtan atdığı məlum olan şəxs cəzalandırıldıqdan sonra belə, gələcəkdə şahidlik haqqından məhrum edilir. Ayənin davamında buyurulur: «...Onların şəhadətini heç vaxt qəbul etməyin».

İmam Sadiq (ə) buyurur: «Müsəlmanı onda olmayan xüsusiyyətə görə ittiham edən şəxsin qəlbindəki iman əriyər. Necə ki, duz suda əriyir!»(١).

**Sual ١٢٧**

Sual ١٢٧: Ananın otağına icazəsiz daxil olmaq olarmı?

Cavab: «Nuh» surəsinin ١٢٧-ci ayəsində buyurulur: «Ey iman gətirənlər, başqalarının evlərinə sahiblərindən icazə almadan və onlara salam vermədən girməyin».

Ayədəki göstəriş bütün xalqlar və mədəniyyətlər tərəfindən məqbul hesab edilir.

İnsan həyatı fərdi və ictimai olmaqla, iki hissədən ibarətdir. Cəmiyyətə çıxan insan, cəmiyyətdə qəbul olunmuş qayda-qanunlara əməl etməli, geyiminə və hərəkətlərinə hədd qoymalıdır. Məlum məsələdir ki, bu çərçivə sıxıntı doğurur və insan öz daxilində istirahətə ehtiyac duyur. Mənzilinə dönmüş insan ictimai mühitdə ayrıldıqdan sonra fərdi həyatını istədiyi kimi qurmaqla rahatlanmalıdır. Hər bir insan öz mənzilində istədiyi kimi geyinə və istədiyi kimi rahatlana bilər.

Təsəvvür edin ki, ağır ictimai fəaliyyətdən sonra evdə uzanıb istirahət edirsiniz. Əyninizdə isə yüngül zolaqlı penjama vardır. Sizi mürgü aparır və diksinib oyananda qarşınızda bu vaxtadək ədəblə davrandığınız iş yoldaşınızı görürsünüz. Belə məqamda narahatçılıq təbiidir. Axı, bu şəxs siz paltarınızı dəyişərkən də daxil ola bilərdi!

Demək, başqasına məxsus otağa icazəsiz girmək olmaz!



---

١- [١٤١] «mənbə kamil deyil} «Üsuli-kafi}.

Həzrət Peyğəmbərdən (s) soruşurlar: «Ananın otağına icazəsiz girmək olarmı?». Həzrət «olmaz», buyurur. Sual verən şəxsin təəccübləndiyini görüb, əlavə edir: «Ananı çılpaq .(görmək xoş deyil»(١

## Sual ١٢٨

?Sual ١٢٨: Doğrudanmı, Quranda qadınlara örtünmək əmr olunmayıb

Cavab: Qurani-kərimdə din haqqında az bilib, çox danışanlar haqqında ayələrə tez-tez təsadüf olunur. Bütün cəmiyyətlərdə belə cahil insanlar kifayət qədərdir. Onlar insanların dini biliklərinin azlığından istifadə edərək, öz nəfs istəklərini sübuta yetirmək üçün «filan şey Quranda yazılıb, filan şeysə yazılmayıb» deməkdən belə çəkinmirlər. Bu məsuliyyətsiz insanlar şeytan fitvasına uyub, «Quranda hicab əmr olunmayıb» ?deməklə, sadə və imanlı qadınlarda vəsvəsə icad edirlər. Bu, doğrudan da, belədirmi

Qurani-kərimin «Nur» surəsinin ٣١-ci ayəsində deyilir: «Mömin qadınlara de ki, ...öz-özlüyündə görünənlər istisna olmaqla, zinətlərini göstərməsinlər; baş örtüklərini .«...yaxalarının üstünə çəksinlər

Ayədən göründüyü kimi hicab vacib buyurulmuşdur. Bəs hicabın fəlsəfəsi nədir? Başqa ?sözlə, hicabsızlığın, açıq-saçıqlığın zərəri varmı

Qadınların örtüksüzlüyündən onların şəxsiyyətinə, eləcə də, cəmiyyətə vurulan :zərbələrə diqqət edin

Normal cəmiyyətdə insanların ruhi sakitliyinə təminat verilməlidir. Qadınların . ١ ;örtüksüzlüyü, kişiləri həyəcanlandırır, bəzən isə cinayətlər də baş verir

;Hicabsızlıq, ər-arvad arasında soyuqluq yaradır, cəmiyyətdə boşanmalar çoxalır .٢

.Hicabsızlıq fahişəliyin genişlənməsi üçün zəmindir .٣



---

.Təfsiri Nurus-səqəleyn», ٣-cü cild, səh. ٥٨۴» [١۴٢] -١

Örtüksüzlüyə rəvac verilən cəmiyyətlərdə qadın şəxsiyyəti tənəzzül edir, qadınlar .۴ .istedadlarına görə yox, xarici görünüşünə görə qiymətləndirilir

## Sual ۱۲۹

?Sual ۱۲۹: Kasıblığa görə evlənməməmək olarmı

.(Həzrət Peyğəmbər (s) buyurur: «Evlənən şəxs dininin yarısını hifz etmişdir»(۱

Öz cinsi istəklərini təmin etmək üçün insan hətta cinayətə gedirsə, demək bu hiss onun xarakterində mövcuddur və onu qanuni yolla təmin etmək zəruridir. Cinsi istəkləri təmin olunmayan şəxs ruhu sarsıntılar içində qovrularaq, normal zehni və fiziki fəaliyyətdən geri qalır. Cinsi yetkinliyə çatmış gənc evlənə bilmirsə, həm özü, həm də cəmiyyət üçün problemlər yaradır. Bəs müasir dünyamızda gənclərin evlənmək imkanından məhrumluğunun əsas səbəbi nədir? Nə üçün şəhərə nisbətən kənd ?cavanları daha tez evlənir

Hal-hazırda vaxtında ailə qurmağa mane olan ilkin səbəb kimi, gənclərin iqtisadi durumu göstərilir. Göərəsən, İslam dinində bu problemə münasibət necədir? Həzrət Peyğəmbər (s) buyurur: «Kasıbçılıq qorxusundan evlənməyən şəxs, Allahdan .(bədgüman olub»(۲

Kübar həyat tərzi arzusu, evlənmək istəyən gənclər qarşısında böyük maneədir. Çox ,vaxt gənclər yox



---

.Səfinətül-bihar», ۱-ci cild, səh. ۵۶۱» [۱۴۴] -۱

.Vəsailüş-şiə», ۱۴-cü cild, səh.۲۴» [۱۴۵] -۲

valideynlər bu tələblərlə çıxış edirlər. Həzrət Peyğəmbər (s) isə belə buyurur: «Ən pisqədəm qadın, mehriyyəsi ağır olan qadındır»(۱). Başqa bir hədisdə isə, iqtisadi problemlərə görə övladının ailə qurmasına mane olan valideynlərə belə xəbərdarlıq olunur: «Övladı yetkinlik yaşına çatmış şəxs, onu evləndirmək iqtidarında olduğu təqdirdə evləndirmirsə, övlad günaha batsa, bu günah hər ikisi üçün yazılar»(۲).

Gənclərin vaxtında evlənə bilməməsi, cəmiyyətdə əxlaqsızlığa rəvac verir. Eyni zamanda, əxlaqsızlıq yuvalarının mövcudluğu gənclərin evlənməsinə mane olan səbəbdir. Kənd yerlərində belə yuvaların olmaması, gənclərin vaxtında ailə qurmasının şərtlərindəndir.

**Sual ۱۳۰**

Sual ۱۳۰: «Nur» ayəsi kimə şamildir?

Cavab: Qurani-kərimin «Nur» surəsinin ۳۵-ci ayəsi «Nur» ayəsi kimi məşhurdur: «Allah göylərin və yerin nurudur...».

Qurani-kərimdə və İslam rəvayətlərində yeddi şey «nur» kimi xatırlanır:

۱. Qurani-kərim(۳);

۲. Allaha iman(۴);

۳. İlahi hidayət – Allah-təalanın öz bəndələrini doğru yola yönəltməsi(۵);

۴. İslam dini(۶);



---

۱- [۱۴۶] «Vəsaliüş-şiə», ۱۵-ci cild, səh.۱۰.

۲- [۱۴۷] «Məcməül-bəyan».

۳- [۱۴۸] «Maidə» surəsi, ayə ۱۵.

۴- [۱۴۹] «Bəqərə» surəsi, ayə ۲۵۷.

۵- [۱۵۰] «Ənam» surəsi, ayə ۱۲۲.

۶- [۱۵۱] «Tövbə» surəsi, ayə ۳۲.

;(Həzrət Məhəmməd (s)[۱] .۵

;İmamlar və məsum rəhbərlər .۶

.Elm və bilik .۷

Günəş sistemində nurun ilkin mənbəyi günəş olduğu kimi, sadalananlar arasında da nurun ilkin mənbəyi Allahdır. Quran Onun kəlamı və İslam Onun ayini olduğu, peyğəmbər Onun tərəfindən göndərildiyi və imamlar Onun ayinlərini hifz etdiyi üçün, .nur hesab edilir

**Sual ۱۳۱**

?Sual ۱۳۱: Həqiqi dost varmı

Cavab: Dini dəyərlərin ayaq altına alındığı cəmiyyətlərdə xəyanət, eqoizm kimi çirkin sifətlərin artması tam təbiidir. Məhz belə cəmiyyətlərdə «dost yoxdur», «dost mənim .cibimin pulu» kimi əsassız fikirlər dolaşmaqdadır

Qurani-kərimin müxtəlif ayələrində «dost» kəlməsi işlədilir və dostlarla münasibətin necə qurulmasına işarə olunur. «Nur» surəsinin ۶۱-ci ayəsində «müsəlman kimlərin süfrəsində icazə almadan otura bilər» sualına verilən cavabda ata-ana, bacı-qardaşla .yanaşı dostlar da xatırladılır

İmam Sadiq (ə) buyurur: «Müəyyən həddlər və şərtlərə əməl olunmadan dostluq :mümkün deyildir. Dostda beş xüsusiyyət olmalıdır

;Üzdə və arxada bir olsun .۱

;Sənin abrını öz abrı, sənin eyibini öz eyibi bilsin .۲

;Vəzifəsi, var-dövləti dəyişəndə sənə münasibəti dəyişməsin .۳

;Gücü çatanı sənə müzayiqə etməsin .۴

.«Çətin günündə səni tək qoymasın .۵

## Sual ۱۳۲

?Sual ۱۳۲: Kafirlərin xeyir əməllərinin savabı varmı

Cavab: «İbrahim» surəsinin ۱۸-ci ayəsində buyurulur: «Rəbbini inkar edənlərin əməlləri fırtınalı bir gündə küləyin sovurub apardığı külə bənzəyir. Onlar etdikləri əməllərdən heç bir fayda əldə edə bilməzlər». «Furqan» surəsinin ۲۳-cü ayəsində isə belə oxuyuruq: .««Biz onların etdikləri əməlləri qəsdən dağınıq zərrələrə döndərdik

İmam Baqir (ə) buyurur: «Qiyamət günü Allah-təala ağ libas geymiş tək nura bürünmüş bir tayfa gətirər. Sonra «dağınıq toz zərrələrinə dönün» buyurar. Həmin nurda əsər-əlamət qalmaz». Hədisdə işarə olunan nur, kafirlərin dünya həyatında .göründüyü xeyir işlərdir

Rəvayətlərə əsasən günah savabın üstünü örtür. Məsələn, şərab içənlər haqqında .(buyurulur: «Şərab içən şəxsin əməlləri Allah dərgahında ۴۰ gün qəbul olunmaz»(۱

Kafirlərin xeyir işlərinin puça çıxması, tam məntiqə uyğundur. Təsəvvür edin ki, sizə atəş açan düşmənin gülləsi arxadan sizə hücum edən ayıya dəyir. Bu işinə görə ona təşəkkür düşürmü? Əlbəttə ki, yox! Kafirin xeyir əməli də belədir. Əgər o Allahı razı salmaq niyyəti ilə bir iş görsəydi, Allah da ona savab verərdi. Vəzifə, ad-san naminə xeyir iş görən insanın niyyəti saf deyil. Məsələn, deputat seçilmək istəyən biri kasıb-kusuba pul paylayır ki, əvəzində səs alsın. Onun niyyəti savab yox, səs qazanmaqdır. !Bir səs ki, qiyamət səhnəsində eşidilməz



---

.Səfinətül-bihar», ۱-ci cild, səh.۴۲۷» [۱۵۳] -۱

**Sual ۱۳۳**

?Sual ۱۳۳: Qurani-kərim nə üçün bir dəfəyə yox, tədricən nazil olub

Cavab: İslami rəvayətlərə əsasən, Quran iki dəfə nazil olmuşdur: birinci dəfə Qədr .gecəsində tam şəkildə, ikinci dəfə iyirmi üç il ərzində tədricən

Fürqan» surəsinin ۳۲-ci ayəsində buyurulur: «Kafirlər «Quran ona bütöv şəkildə nazil» olmalı idi» dedilər. (Ya Məhəmməd) Sənin ürəyinə qətiyyət vermək üçün Biz onu ayə-.«ayə nazil etdik

Əvvəla, Quranın tədriclə nazil olması, insanların təbiətinə və ehtiyaclarına daha uyğun bir üsuldur. İnsan məqsədə addım-addım yaxınlaşdıqda, mətləblər daha aydın dərk .olunur

Quran bədii əsər yox, həyat proqramıdır. Hər hansı proqram isə, cəmiyyətdə mərhələ-.mərhələ həyata keçə bilər

Bədr, Ühüd, Əhzab, Hüneyn kimi müharibələrə isti münasibət bildirən Quran, birbaşa .necə nazil ola bilərdi?! Başqa bir tərəfdən nüzulun davamı peyğəmbərliyin davamı idi

**Sual ۱۳۴**

?Sual ۱۳۴: Heyvan, yoxsa nəfsini özünə tanrı edən insan daha çox zəlalətdədir

Cavab: «Furqan» surəsinin ۴۴-cü ayəsində nəfsinə itaət edənlər haqqında buyurulur: .««Onlar heyvan kimidirlər, bəlkə ondan daha çox zəlalətdədirlər

Uyğun mövzuda araşdırma aparan təfsirçilər bu qənaətdədirlər ki, heyvanlar altı :cəhətə görə nəfsini özünə tanrı edən insandan üstündürlər

Düşünmə istedadından məhrum olan heyvanların nöqsanlı hərəkətləri bağışlana .۱ ;bilər

;Heyvanlara ilahi hökm, kitab nazil olmadığından onlar üçün cəza da yoxdur .۲

;Heyvanlar cəmiyyət üçün həmişə faydalıdırlar .۳

;Heyvanlar nə qədər vəhşi olsalar da, müharibə törətmək qüdrətində deyillər .۴

İnsan, əqlini nəfsinə qurban verdiyi halda, heyvanlar öz təbii xüsusiyyətlərindən … .۵ ;instinkdən kənara çıxmır

.Heyvanlar öz pis işini yaxşı qələmə vermir, necə varsa, elə də görünürlər .۶

## Sual ۱۳۵

?Sual ۱۳۵: Şirin su şor suya qatışmadan dura bilərmi

Cavab: «Fürqan» surəsinin ۵۳-cü ayəsində buyurulur: «Birinin suyu çox şirin, digərininki isə olduqca şor olan iki dənizi qovuşduran, aralarında sədd qoyan Odur». Ayədə Allah-.təala əzəmətinin dəlili olan yaranış nizamının incəliklərindən danışılır

Maraqlıdır, şirin və şor su arasında qoyulan gözəgörünməz sədd nədir? Elmin bu günkü naliyyətlərindən istifadə edərək, həmin «gözəgörünməz sədd»in qatılıqlar arasındakı fərqdən ibarət olduğunu deyə bilərik. Başqa sözlə, şirin suyun qatılığı şor suyun qatılığından fərqlənir və bu fərq, sanki onlar arasında çəkilmiş pərdə rolunu .oynayır

Bəs, bir-birinə qovuşmuş, biri şirin o biri isə şor iki dəniz haradadır? Cavab belədir ki, bütün böyük çayların dənizə töküldüyü yerdə şirin su kütləsi yaranır və bu kütlə uzun müddət qorunur. Təyyarə vasitəsilə uyğun su kütlələrinin üzərindən uçduqda, şirin su .ilə şor su arasındakı sərhəd aydın görünür

## Sual ۱۳۶

?Sual ۱۳۶: Günah savabla əvəz oluna bilərmi

Cavab: «Fürqan» surəsinin ۷۰-ci ayəsində oxuyuruq: «(Günahkarlar əzaba düçar olarlar) Ancaq tövbə edib

iman gətirən və yaxşı işlər görənlərdən başqa. Allah onların pis əməllərini yaxşı əməllərə çevirər».

Sevimli səhabə Əbuzər Peyğəmbərdən (s) belə nəql edir: «Qiyamət günü Allah-təala bəzi insanların böyük günahlarının üstünün açılmaması barədə göstəriş verər. Kiçik günahları haqqında sorğuya çəkilən bu insanlar həmin günahları etiraf edərkən, öz böyük günahları haqqında düşünüb, qorxarlar. Bu zaman Allah-təala istədiyi bəndələrin hər bir günahı əvəzində bir savab verilməsini buyurar. İnsan heyrət içində böyük günahlarını axtara-axtara qalar»(١).

Lakin ayə və hədisdə deyilənlər, yalnız həqiqi tövbə edənləri nəzərdə tutur. Həqiqi tövbə isə günahın çirkinliyinə, ondan gələn zərər-ziyana görə olmalıdır. Əgər bir insan yalnız orqanizmə zərərinə görə spirtli içkiləri atırsa, bu həqiqi tövbə deyildir. Həqiqi tövbə Allahın yoluna qayıdış, Allahı razı salmaq niyyəti ilə həyata keçirilməlidir.

### Sual ١٣٧

Sual ١٣٧: Güc çatmayan məsələni necə həll etmək olar?

Cavab: «Fürqan» surəsinin son ayəsində buyurulur: «De ki, duanız olmasa, Rəbbimin yanında heç bir dəyəriniz yoxdur».

Ayə və rəvayətlərdə duanın əhəmiyyətinə kifayət qədər işarə olunmuşdur. Nəfsini paklandırmaq, kamil bir insan olmaq qərarına gəlmiş insan üçün ilk yardımçı duadır. İnsan qüdrətindən xaric olan bütün işlər həqiqi dua ilə həyata keçir. Sadə bir misal: Min dörd yüz ildir ki, İslama ümid yeri, sığınacaq kimi baxan cəmiyyətlərdə «Allahdan yağış istəmək» kimi bir ənənə vardır. Quraqlıqdan məhv olma təhlükəsi ilə üzləşmiş əkin sahələrini xilas etmək üçün



---

١- [١۵۴] «Nurus-səqəleyn», ۴-cü cild, səh. ٣٣.

insanlar çiyin-çiyinə dayanıb, namaz qılır və Allahdan yağış istəyirlər. Belə duaların .haradasa qəbul olunmamasına təsadüf olunmayıb

Lakin duanın şərtləri vardır. İlkin şərt dua zamanı çağırdığın Allahı tanımaqdır. Dua məqamında ruhun paklığı, onun hazırlığı ikinci şərtdir. Duanın üçüncü şərti, Allahı razı salmaqdır. Əgər Allah-təala bir insandan narazıdırsa, çətin ki, onun duasını qəbul edə. .Dua zamanı bütün diqqətin Allaha yönəldilməsi, duanın dördüncü şərtidir

İslam Peyğəmbəri (s) buyurur: «Dua möminin silahı, dinin sütunu, yerin və göyün .(nurudur»(١

**Sual ١٣٨**

?Sual ١٣٨: İslamda şerə və şairə münasibət necədir

Cavab: İslamın «insan azadlıqlarını məhdudlaşdıran» bir ideologiya kimi təqdim olunmasında maraqlı olanlar, Quranın bir ayəsini ayrıca götürərək, manevr edirlər. Belə ayələrdən biri «Şüəra» surəsinin ٢٢۴-cü ayəsidir. Ayədə buyurulur: «Şairlərə gəlincə, onlara yalnız azğınlar uyar». İlk baxışdan belə görünə bilər ki, İslam dini şer və şairlə müxalifdir. Hansı ki, uyğun surənin ٢٢٧-ci ayəsində qeyd olunur: «Ancaq iman gətirib yaxşı işlər görən, Allahı çox zikr edən, zülmə uğradıqdan sonra intiqamını .«!alanlardan başqa

Ayədə açıq-aşkar şəkildə həqiqətə «boyun əyən» şerlər və şairlər istisna olunur.Əksər sənət sahələrinə diqqət etsək, mənfi və müsbət olmaqla, iki istiqamətlə rastlaşırıq. Götürək rəssamlığı. Əgər rəssam öz istedadını zülm və əxlaqsızlığın təbliğinə sərf edirsə, Əlbəttə ki, onun fəaliyyəti zərərlidir. Olsun musiqi. Musiqi insanları əyyaşlığa, kazino



---

.Üsuli-kafi», ٢-ci cild» [١۵۵] -١

və barlara səslədiyi kimi, döyüş meydanlarına da haraylaya bilər. Şer də belədir. Ədaləti, həqiqəti, vətən sevgisini təbliğ edən şer nəinki pis deyil, olduqca təqdirəlayiqdir. Həzrət Məhəmməd (s) buyurur: «Şerin bəzisi hikmət, bəzisi isə sehrdir».(١)

Müasir dünyamızda eyş-işrətin təbliği o qədər güclənmişdir ki, əksər sənət sahələri onun inhisarına düşmüşdür. Bu gün həqiqəti, yoxsa rəzaləti təbliğ edən şerlər çoxdur? Ümumiyyətlə, Nizami, Füzuli kimi şairlər yetirmiş xalq şer haqqında nə düşünür? Düşünək!

## Sual ١٣٩

Sual ١٣٩: Süleyman peyğəmbərin macəraları bizə nə öyrədir?

Cavab: Qurani-kərim «Nəml» surəsinin ١۶-۴٣-ca ayələrində Süleyman haqqında buyurur:

«...Biz Davuda və Süleymana elm verdik».

«...Süleyman Davuda vərəsə oldu və dedi: «Ey insanlar bizə quş dili öyrədildi».

«...Süleyman insan, cin və quşlardan ibarət qoşun topladı»

«...Sonra Süleyman quşları yoxlayıb, dedi: «Hüd-hüdü niyə görmürəm?».

«...And olsun ki, aşkar bir dəlil gətirməsə, ona şiddətli əzab verərəm».

Hüd-hüd gəlib dedi: «Sənin bilmədiyin bir şey öyrəndim. Sənə Səbadan doğru xəbər gətirmişəm».

«...Mən onlara padşahlıq edən bir qadın gördüm».

«...Mən onun və tayfasının Allahı qoyub, günəşə sitayiş etdiklərini gördüm».



---

١- [١۵۶] «Əl-ğədir», ٢-ci cild, səh.٩.

«...Süleyman dedi:) Mənim bu məktubumu apar, onlara at)»

.«...Məktubun məzmunu) Mənə qarşı təkəbbür göstərməyin, yanışa müti olaraq gəlin)»

«...Səba padşahı Bəlqis dedi:) Mən onlara bir hədiyyə göndərəcəyəm)»

.«...?Süleymanın yanına gəldikdə, o dedi: «Siz mənə var-dövlətləmi yardım edirsiniz»

.«?hansınız Bəlqisin taxtını mənə gətirə bilər...»

.«Kitabdan xəbəri olan birisi, «mən onu sənə bir göz qırpımında gətirərəm» dedi»

.«Süleyman ona (Bəlqisə) Allahdan başqasına ibadət etməyi qadağan etdi»

Maraqlıdır ki, Süleymanın macərasını ətraflı şəkildə bəyan edən Qurani-kərim, insanların diqqətini nəyə yönəltmək istəyir? Təfsirçilər uyğun macəradan aşağıdakı :göstərişləri nəticə çıxarırlar

Hökumət rəhbəri öz ətrafına o qədər diqqətli olmalıdır ki, hətta bir işçinin . ١ ;yoxluğundan xəbərdar olsun

Bir nəfərin səhvə görə cəzalandırılmaması, başqalarını da doğru yoldan azdırır. . ٢ ;Rəhbər buna yol verməməlidir

;Cəzalandırılacaq şəxsə özünü müdafiə etmək üçün şərait yaradılmalıdır .٣

;İstər rəhbər, istər adi fərd, dəlil və məntiqə tabe olmalıdır .۵

Cəmiyyətdə azadlıq elə bir səviyyəyə çatmalıdır ki, adi fərd hökumət başçısına . ۶ ;sözünü deyə bilsin

;Kimsə öz biliyi ilə kifayətlənməməlidir .٧

Cəmiyyətdə idarəçiliyin mürəkkəbliyi və Süleyman kimi qüdrətli padşahın adi bir . ٨ ;quşa möhtac ola bilməsi unudulmamalıdır

səh:١٢٩

;Qadın öz zərif təbiəti ilə hökumət başçılığına qadir deyil .۹

.Millət, adətən, rəhbərin dinində olur .۱۰

**Sual ۱۴۰**

?Sual ۱۴۰: Məktub necə yazılmalıdır

Cavab: Həzrət Əli (ə) öz nümayəndələrinə yazırdı: «Qələmlərinizin ucunu iti edin. Sətirləri bir-birinə yaxın yerləşdirin. Məktublarınızdan artıq sözləri çıxarın. Daha çox mənaya diqqət edin. Uzunçuluqdan çəkinin, çünki müsəlmanların büdcəsində artıq .(xərcə imkan yoxdur»(۱

Qələmin ucu iti olarsa, sözlər kiçik yazılar. Sətirlər bir-birinə yaxın olduqda, yerlə yanaşı yazanın və oxuyanın vaxtına da qənaət olunar. Deyilənlərə nümunə olaraq, həzrət Məhəmmədin (s) Xosrov Pərvizə, Rum Qeysərinə yazdığı məktubları .göstərmək olar

Nəhcül-bəlağə»də oxuyuruq: «Elçi sənin əqlinin təkrarçısıdır. Sənin haqqında ən» maraqlı danışan, yazdığın məktubdur». İmam Sadiq (ə) buyurur: «İnsanın yazdığı .(məktub, onun ağıl səviyyəsini göstərir»(۲

İslam dinində məktubla bağlı bir sıra göstərişlər mövcuddur. Salamın cavabı vacib olduğu kimi məktubun da cavabı vacibdir. Salam haqqında isə Qurani-kərimdə buyurulur: «Sizə salam veriləndə ona ya olduğu kimi, ya da daha gözəl şəkildə cavab .(verin»(۳

**Sual ۱۴۱**

?Sual ۱۴۱: Paklıq nöqsan hesab oluna bilərmi



---

.«Xisali-Səduq» [۱۵۷] -۱

.Biharul-ənvar», ۷۶-cı cild, səh. ۵۰» [۱۵۸] -۲

.Nisa» surəsi, ayə ۸۶» [۱۵۹] -۳

Cavab: Paklıq bəşər övladı üçün ən böyük üstünlükdür. Belə olduğu təqdirdə, paklıq nümunəsi olan peyğəmbərlər və imamlar, övliyalar və zahidlər nə üçün, adətən, ya öz vətənlərindən didərgin düşmüş, ya da zindanlarda əzab-əziyyətə düçar edilmişlər? «Nəml» surəsinin ۵۶-cı ayəsində buyurulur: «Lut tayfasının cavabı, yalnız bu olmuşdu: «Lutun ailəsini yurdunuzdan qovub çıxardın. Çünki onlar təmiz qalmaq istəyən .«insanlardır

Dünyanın bir çox ölkələrində hökm sürən zorakı rejimlər, adətən, bir qrup mənsəbpərəst rüşvətxordan ibarətdir. Pak insanlar millətlərin çəkdiyi zülm və sitəmlərlə barışmayıb hər zaman qiyam arzusunda olduqlarından, belə cəmiyyətlərdə .onlara yer olmur

Şərqdə geniş yayılmış «Dabbağ və ətir» hekayəsi uyğun mövzuda gözəl misaldır: Daim üfunətli dərilər arasında işləyən Dabbağ bir gün təsadüfən əttarlar küçəsindən keçir. Ətirlərin qoxusundan bihuş olmuş dabbağ, ölümcül vəziyyətə gəlir. Onu müayinə edən təbib, Dabbağın təcili üfunətli dabbağxanaya aparılmasını məsləhət görür. Dərilərin .qoxusu dabbağın burnuna dəydikcə, o özünə qayıdır

Bəli, bəşər tarixi boyunca günahkarlığa rəvac verilmiş cəmiyyətlərdə paklıq, vicdan, dindarlıq nöqsan hesab olunmuşdur. Belə cəmiyyətlərdə spirtli içki içməyən, haram .tikə yeməyən, yalan danışmayan insanlara yer olmamış və olmayacaqdır

**Sual ۱۴۲**

?Sual ۱۴۲: «Muztərr» kimdir

Cavab: «Muztərr» ərəbcədən tərcümədə, «əli hər yerdən üzülmüş» mənasını verir. «Nəml» surəsinin ۶۲-ci ayəsində oxuyuruq: «(Bütlər yaxşıdır) Yoxsa əli hər yerdən üzülüb darda qalan kimsənin duasını qəbul edən, şəri sovuşduran, sizi yer üzünün varisləri təyin edən Kəs?!».

Sözsüz ki, Allah-təala bütün ilkin şərtlərə əməl edən insanın duasını qəbul edir. Lakin yuxarıdakı ayədə zikr olunan çarəsizlik halı duanın qəbul olunmasının başlıca şərtlərindəndir. Bu hala düşmüş insan, öz müşkülünün həllində yalnız Allahı təsirli bilir və Ondan başqa heç bir kimsədən yardım gözləmir.

Ayədən belə bir nəticə çıxarmaq olmaz ki, mömin bəndə əlini yanına salıb, hərəkətsiz bir halda Allahdan çarə gözləməlidir. O, sadəcə çalışdığı zaman hər şeyin Allah iradəsindən asılı olduğunu unutmamalıdır. İmam Sadiq (ə) buyurur: «Bu ayə Məhəmməd (s) ailəsindən olan imam Mehdi (ə) haqqındadır. And olsun Allaha «müztərr» Odur. O, İbrahim məqamında durub, əllərini Allah dərgahına qaldırar və dua edər. Allah-təala onun duasını qəbul edib, bütün narahatçılıqları aradan qaldırar və onu yer üzünə xəlifə təyin edər»(۱).

Əlbəttə ki, ayə təkcə əsrin imamı Mehdiyə (ə) şamil olunmur. Sadəcə, ayənin məfhumunun aydınlaşması üçün imam Mehdi (ə) ən gözəl nümunədir. Həzrətin (ə) zühurundan öncə dünyanı zülm-sitəm bürüyəcəyi, əksər insanların əlinin hər yerdən üzüləcəyini bilirik. Həmin dövrdə dünyanın müxtəlif nöqtələrində çarəsiz insanlar Allah dərgahına əl açıb, qurtuluş istəyəcəkdir. Allahın bu



---

۱- [۱۶۰] «Təfsiri Nurus-səqəleyn», ۴-cü cild, səh. ۹۴.

.duaları qəbul etməsi ilə, həzrət Mehdinin (ə) zühuru gerçəkləşəcəkdir

### Sual ۱۴۳

?Sual ۱۴۳: Qiyamətdən əvvəl gerçəkləşəcək rəcət hadisəsinin fəlsəfəsi nədir

Cavab: Şiə müsəlmanların etiqad etdiyi rəcət, ۱۲-ci imam Mehdinin (ə) zühurundan sonra, qiyamət ərəfəsində bir qrup xalis mömin və xalis kafirin mükafat və cəza üçün .dünyaya qayıdışıdır

Məşhur şiə alimi Seyid Mürtəza deyir: «Allah-təala həzrət Mehdinin (ə) zühurundan sonra dünyasını dəyişmiş bir qrup insanı dünya həyatına qaytaracaqdır. Onlar İmama (ə) yardımçı olmaq və ədalətli hökumətin bütün dünyanı bürümüş hakimiyyətini müşahidə etmək iftixarına yetişəcəklər. Həmin mömin insanlarla yanaşı, bir qrup kafir .«intiqam üçün dünya həyatına qaytarılacaqdır

Mərhum Əllamə Məclisi deyir: «Rəcət hadisəsini təsdiq edən Əhli-beyt hədislərinin sayı, .«iki yüzdən çoxdur

Belə bir sual verilə bilər ki, qiyamətdən sonra rəcət hadisəsinin gerçəkləşməsinin nə əhəmiyyəti vardır? İslam rəvayətlərindən belə aydın olur ki, bu hadisə yalnız bir qrup xalis mömin və xalis kafirə aiddir. Möminlərin qayıdışı onların tam kamilləşməsi, kafirlərin qayıdışı məhz dünya əzabını dadmaları üçündür. Əvvəlki dünya həyatında kafirlərin maneçiliyi səbəbindən imanını kamilləşdirməyə fürsət tapmayanlar, rəcət zamanı arzularına çatırlar. İmam Sadiq (ə) buyurur: «Rəcət ümumi deyildir. Yalnız xalis .(imanlılar və xalis kafirlər dünya həyatına qayıdarlar»(۱



---

.Biharul-ənvar», ۵۳-cü cild, səh.۳۹» [۱۶۱] -۱

## Sual ۱۴۴

?Sual ۱۴۴: İslam kasıbçılığı bəyənirmi

Cavab: Bər-bəzəkli, kübar həyat tərzini tənqid edən İslam, kasıbçılığın təbliğindən olduqca uzaqdır. İslam bütün sahələrdə təfrit və ifratı pisləyərək, orta həddin daha faydalı olduğunu önə çəkir. Ayə və hədislərdə dünya yox, dünyaya ifrat bağlılıq nəhy olunur. İmam Sadiq (ə) buyurur: «Dünya, axirətə çatmaq üçün gözəl bir yardımdır»(۱).

İslam, axirət dünyası üçün faydalı olan sərvəti bəyənir. İslam, bəşəriyyət üçün faydalı var-dövləti təqdir edir. İslam, cəmiyyəti insani dəyərləri önə çəkən mal-dövləti xeyirli bilir. Ailənin ehtiyaclarını təmin etmək, imkansızlara əl tutmaq, Allah yolunda qədəm götürmək məqsədi ilə sərvət qazanmaq qəbahət yox, müqəddəs işdir.

İmam Sadiq (ə) buyurur: «Səni başqalarının haqqına təcavüzdən saxlayan ehtiyacsızlıq, səni günaha çəkən kasıbçılıqdan üstündür»(۲).

Uyğun mövzuda ilahi buyuruqlardan, məsumların kəlamlarından aşağıdakı nəticələr alınır:

- Kasıb millətin azadlığı və başıucalığı qeyri-mümkündür;

- Kasıblıq, asılılıqdır;

- Kasıblıq, dünya və axirətdə üzüqaralıqdır;

- Kasıblıq, insanı günaha çağırır ...

## Sual ۱۴۵

?Sual ۱۴۵: Ata-anaya nə zaman itaət olunmamalıdır

Cavab: Allah-təala insanı valideynlərə ehsana çağıraraq buyurur: «Biz insana ata-anasına yaxşılıq etməyi tösiyə etdik...»(۳). «Loğman» surəsinin ۱۵-ci ayəsində «dünya işlərində onlarla gözəl keçin» buyurulur.

۱- [۱۶۲] «Vəsailuş-şiə», ۱۲-ci cild, səh.۱۷.

۲- [۱۶۳] «Vəsailüş-şiə», ۱۲-ci cild, səh. ۱۷.

۳- [۱۶۴] «Ənkəbut» surəsi, ayə ۸.

Valideynə yaxşılığın əhəmiyyəti, Əhli-beyt (ə) hədislərində daha qabarıq nəzərə çarpır. Allah-təalanın valideynə mərhəmətinin sonsuzluğunu anlamaq üçün «behişt ananın ayaqları altındadır» hədisini xatırlamaq kifayətdir. Bəs valideyn kafir olsa necə, ona yenə də yaxşılıq etmək zəruridirmi? İslam dini hətta kafir valideynə də ehtiram göstərilməsini vacib bildirir. Amma elm və məntiq dini olan İslam, heç bir sahədə ifrata yol vermir. Belə ki, övladı əyri yola sürükləyən, onu namaz və oruc kimi vacib ilahi əmrlərə itaətdən çəkindirən valideynə həmin məsələlərdə itaət olunmamalıdır. Qur´ani-kərimdə oxuyuruq: «Əgər valideynlərin bilmədiyi bir şeyi Mənə şərik qoşsalar, onlara itaət etmə»(١). Həzrət Əli (ə) «Nəhcül-bəlağə»də buyurur: «Allaha üsyan etməklə, bəndəyə itaət etmək olmaz».

Nəticə olaraq qeyd edək ki, heç bir kimsə Allahla bəndə arasına girə bilməz. Nə padşah, nə rəis, nə də ki ata-ana insanı dini vəzifələrinin icrasından saxlamaq səlahiyyətinə malik deyildir.

### Sual ١۴۶

Sual ١۴۶: Günahdan çəkinmək istəyən insan nə etməlidir?

Cavab: Xəstəxana, idman zalı, həbsxana nə üçündür? Heç şübhəsiz ki, insanın mənəvi və fiziki tərbiyələndirilməsi üçün! Amma ötəri bir xəstəliklə əlaqədar həkimə müraciət edən şəxs düzgün müalicə olmazsa, ağır xəstəliyə düçar ola bilər. Az olmayıb ki, gözləri zəif görən insan göz cərrahiyyə əməliyyatından sonra kor olub. Amma həmin adamlar ümidini üzməyib, başqa həkimə müraciət ediblər.



---

١- [١۶۵] «Ənkəbut» surəsini, ayə ١۵.

Cəld və güclü olmaq həvəsi ilə müəyyən bir idman növü ilə məşğul olub, ehtiyatsızlıq üzündən şikəst olanlar da var. Amma bu sayaq uğursuzluqlara baxmayaraq, insanlar .idmandan üz döndərmir

Hansısa kiçik bir səhvə görə həbsxanaya düşüb, oradan narkoman kimi çıxanlar da az .deyil. Amma həbsxanalar mövcuddur və gələcəkdə də mövcud olacaq

.(Qurani-kərimdə buyurulur: «Namaz insanı çirkin işlərdən çəkindirir»(١

Bəli, müttəqilərə doğru yol göstərən Quran, günahdan çəkinmək istəyənləri namaza çağırır. «Filan namaz qılan nə üçün çirkin işlərdən çəkinməyib» sualına yuxarıdakı misallar cavab verir. Ayədə həqiqi namaz nəzərdə tutulur. Əsl həkim şəfabəxş, əsl idman faydalı, əsl həbsxana tərbiyəverici olduğu kimi, əsl namaz da istisnasız olaraq, insanı günahdan uzaqlaşdırır. Həqiqi namazın şərtləri vardır. Namazda xalis niyyət, Allahın əzəmətini, özünün kiçikliyini anlamaq əsas şərtlərdəndir. İmam Sadiq (ə) buyurur: «Namazın qəbul olunmasının əlaməti, onun insanı çirkinlikdən .«uzaqlaşdırmasıdır

## Sual ١۴٧

?Sual ١۴٧: Hansı musiqi haramdır

Cavab: Quranın ayələri və Əhli-beyt (ə) hədislərində musiqinin xüsusi bir növü olan «ğina» haram buyurulmuşdur. Bəzi dinşünasların fikirincə, İslam ümumiyyətlə bütün musiqiləri qadağan edir. Əslində, Peyğəmbər dövründə musiqiyə sərt münasibətin əsasını həmin dövrdə yalnız ğinanın mövcudluğu təşkil edir. İstər musiqisi, istər sözləri .insanda yalnız mənfi hisslər aşılayan ğinanın haram buyurulması, məntiqə uyğundur



---

.Ənkəbut» surəsi, ayə ۴۵» [١۶۶] -١

Ğina insanı ruhi tarazlıq vəziyyətindən çıxarır, onu eyş-işrətə, əxlaqsızlığa sövq edir. Qurani-kərimin «Fürqan» surəsinin ۷۲-ci ayəsində buyurulur: «Allahın xalis bəndəsi o şəxslərdir ki, batilə şahid durmaz, puç bir şeylə rastlaşdıqda, ondan üz çevirib, keçərlər». İmam Sadiq (ə) bu ayə haqqında buyurur: «Bu ayədə ğina nəzərdə tutulur.

Musiqisi və sözləri insanı doğru yoldan azdıran ğinanın insan mənəviyyatına bir çox mənfi təsirləri vardır:

Ğina oxunan ev qəm-qüssədən amanda qalmaz», «Ğina oxunan evdə dua qəbul olmaz», «Ğina oxunan evə mələk nazil olmaz»(۱).

**Sual ۱۴۸**

Sual ۱۴۸: Lovğa yeriş insanı hara aparır?

Uyğun Quran ayələrindən bir daha aydın olur ki, İslam dini öz ardıcıllarının bütün suallarına əhatəli cavab verir. Mömin müsəlmanlara, hətta öz yerlərində müvazinəti gözləmək sifariş olunur. İlk baxışdan əhəmiyyətsiz görünən yeriş, əslində insan şəxsiyyətinin nişanələrindəndir.

Həzrət Peyğəmbər (s) buyurur: «Lovğa-lovğa, təkəbbürlə yeriyən adama yer, yerin altında yatanlar və üstündə gəzənlərin hər biri lənət oxuyur».(۲)

Başqa bir hədisdə Həzrət (s) buyurur: «Geydiyi libasla lovğalanan insanı, Allah-təala cəhənnəm kənarında



---

۱- [۱۶۷] İmam Sadiqin (ə) kəlamları, «Vəsailüş-şiə», ۱۲-ci cild, səh.۲۲۵.

۲- [۱۶۹] «Səvabul-əmal».

yerin təkinə endirib, Qaruna yoldaş edər. Çünki təkəbbürün bünövrəsini Qarun .(qoyub»(۱

Bir hədisdə nəql olunur ki, Həzrət (s) yoldan keçərkən, adamların bir dəlinin başına .«toplandığını gördü və buyurdu: «Əsl dəli, təkəbbürlə yol yeriyən insandır

**Sual ۱۴۹**

?Sual ۱۴۹: Susmaq nə vaxt qızıl deyil

Cavab: El arasında «danışmaq gümüşdürsə, susmaq qızıldır» məsəli, İslam dinində sükuta verilən dəyəri bir daha təsdiq edir. İmam Sadiq (ə) buyurur: «Sükut, düşüncə rahatlığının əsasıdır». İmam Əli ibni Musa ər-Riza (ə) isə belə buyurur: «Elm, helm və .(sükut, düşüncə əlamətidir. Sükut hikmət qapılarından biridir»(۲

Natiqin çıxış etdiyi məclisdə, müəllimin danışdığı sinif otağında sakitliyə riayət olunması zərurəti hamı tərəfindən qəbul olunmuşdur. Məlum məsələdir ki, insan danışa-danışa dinləmək qabiliyyətindən məhrumdur. Müəllim dərs gedişində sakit oturmayan şagirdi qaldırır və soruşur ki, mən nədən danışırdım? Təbii ki, şagird cavab verə bilmir. .Ətrafda baş verənləri anlamaq üçün sükut zəruri şərtdir

Bəs insan danışa-danışa düşünə bilərmi? Əlbəttə ki, yox! Demək, həyat çətinliklərini ilk !əvvəl düşüncə ilə aradan qaldırmalı olan insan, sükuta möhtacdır

Amma əgər qızıl ən qiymətli şeydirsə, sükut həmişə qızıl deyildir. Özünüz düşünün, bəşəriyyəti ilahi elmlə zinətləndirən peyğəmbərlər, zalım padşahların zülmünü ifşa edən natiqlər, elmin sirlərini övladlarımıza öyrədən müəllimlər sussaydı, dünya nə ,vəziyyətə düşərdi?! Bəli



---

.«Səvabul-əmal» [۱۷۰] -۱

.Vəsail», ۸-ci cild, səh. ۵۳۲» [۱۷۱] -۲

!zəruri olmayan sözü udub susmaqla bərabər, həqiqəti dünyaya izhar etmək də qızıldır

**Sual ۱۵۰**

?Sual ۱۵۰: Bətndəki körpənin oğlan və ya qız olacağını əvvəlcədən təyin etmək olarmı

Cavab: «Loğman» surəsinin ۳۴-cü ayəsinə əsasən, beş sahə haqqında bilik yalnız Allaha :məxsusdur və bəşər övladı üçün bu elmlər müəssər deyil. Bu beşliyə daxildir

;Qiyamətdən xəbərdarlıq .۱

;Yağış .۲

;Ana bətnində körpə .۳

;Gələcək .۴

.Ölüm yeri .۵

Nəhcül-bəlağə»də nəql olunur: «Bir gün Əli (ə) gələcəkdə baş verəcək hadisələrdən» danışarkən, yaxın adamlardan biri soruşdu: «Ey Əmirəl-möminin, sən qeyb elmi ilə tanışsanmı?». Həzrət (ə) gülümsəyərək cavab verdi: «Dediklərim qeyb elmindən deyil. Qeyb elmi yalnız qiyamət elmidir. Allah-təala bətndəki körpənin oğlan və ya qız, gözəl və ya çirkin, xoşbəxt və ya bədbəxt olacağını bilir. Məhz bunlar yalnız Allahın bildiyi .«...qeyb elmlərindəndir. Qalanını isə, Allah öz rəsuluna, Onun rəsulu isə mənə öyrədib

Yaşadığımız elmi-texniki tərəqqi dövründə ana bətnindəki körpə və yağış haqqında proqnozlar verilir. Bəli, məhz proqnoz! Proqnoz isə həqiqətə çevrilməyə də bilər. Proqnoz ilkin məlumatlar olmadan verilə bilməz. Məsələn, hazırda yalnız formalaşmış körpə haqqında proqnoz verilir. Hansı ki, Allah-təalanın bu sahədəki biliyi vaxtla .şərtlənmir. Allah üçün körpənin ۱۰ günlük və ya iki aylıq olmasının heç bir fərqi yoxdur

Yağış haqqında proqnoz verilir. Bu proqnoz yalnız yağışdan bir neçə gün əvvəl verildikdə özünü doğruldur. Allahın elmində isə yayda qışın, qışda yayın yağıntıları son .dəqiqliyinədək məlumdur

**Sual ۱۵۱**

?Sual ۱۵۱: Göz yaşları ölüm mələyini geri qaytara bilərmi

Cavab: Qurani-kərimin müxtəlif ayələrinə əsasən, Allah-təala dünya işlərini mələklər vasitəsi ilə gerçəkləşdirir. Bu mələklərdən bir qrupu ruh alan mələklərdir. Onların .aparıcısı «ölüm mələyi»dir

Peyğəmbər (s) buyurur: «Xəstəliklər və dərdlər ölümün elçiləridir. Ömür başa çatdıqda, ölüm mələyi gəlir və deyir: «Ey Allah bəndəsi, sənə xəbər xəbər dalınca, elçi elçi dalınca göndərdim. Amma son xəbər mənəm!». Sonra deyər: «Allahın dəvətini qəbul et, istər həvəslə, istər həvəssiz!». Ölüm mələyi bəndənin ruhunu çıxaranda, ətrafdakılar şivən qoparıb, göz yaşları axıdarlar. Ölüm mələyi deyər: «Kimin üçün ağlıyırsınız? Kiminçün göz yaşı axıdırsınız? And olsun Allaha ki, onun vaxtı qurtarıb və bütün ruzisini alıb. Allah onu dəvət edib, o da qəbul edib». Yenə əlavə edər: «Ağlamaq istəyirsinizsə, özünüzə .«!ağlayın! Son nəfərinizin ruhunu çıxaranadək, yanınıza gələcəyəm

**Sual ۱۵۲**

?Sual ۱۵۲: Gecəni yatmaq, yoxsa oyaq qalmaq daha faydalıdır

Cavab: Əhli-beyt hədislərindən birində buyurulur: «Alimin yuxusu cahilin ibadətindən üstündür». Maraqlıdır, necə ola bilər ki, yuxu ibadətdən üstün olsun? Başqa bir sual: mürəbbə baldan üstün ola bilərmi? Hamı bilir ki, bal misilsiz bir nemətdir və onu mürəbbə ilə

müqayisə etməyə dəyməz. Bəs bala sirkə qatışsa necə? Əlbəttə ki, belə baldan .mürəbbə yaxşıdır

Sözsüz ki, ibadət yuxudan üstündür. Amma nadan insanın ibadəti, adətən, «qatqı»lı olur. Bu ibadətdə riya, başqalarının nəzərini düşünmək, fikir dağınıqlığı kimi mənfi elementlər kifayət qədərdir. Alim isə yuxunu ibadətə «çevriməyi» bacarır. O, yatarkən dəstəmaz alır, dua oxuyur, sağ tərəfi üstə yatır, ən əsası isə yuxunun vaxtını və .müddətini düzgün təyin edir

Amma başqa bir hal da var. İnsan gecəni oyaq qalıb, ibadətə məşğul olur. «İsra» surəsinin ۷۹-cu ayəsində buyurulur: «Gecə yarı oyan və gecə namazı qıl. Olsun ki, .«Rəbbin səni uca məqama qaldıra

.«Səcdə» surəsinin ۱۶-cı ayəsində oxuyuruq: «Onlar ibadət üçün yataqlarından qalxar»

İmam Baqir (ə) buyurur: «Oruc alov qarşısında sipər olar, sədəqə günahları məhv edər .(və gecə oyanıb ibadət edən insanı Allah yad edər»(۱

Bəli, gecənin əsrarəngiz mənzərəsi, eləcə də, sükutu insan təfəkkürünü oyadır. İnsan .bütün bu incəliklərin xaliqinə yol axtarır

Dərdsiz insan yoxdur. Gecənin yarısı dərdini Allahdan başqa kimə deyəsən?! Dostların, qohumların qapısı bağlı, idarələrin qapısında qıfıl! Yalnız bir olan Allahın qapısı açıq! Bəli, !belə bir məqamda ibadət yuxudan üstündür

## Sual ۱۵۳

?Sual ۱۵۳: Axirət əzabı var ikən, dünya əzabına nə hacət

Cavab: Əgər insan dünya həyatında imtahana çəkilib axirətdə mühakimə olunursa, dünyadakı bəlaların məntiqi nədir? «Səcdə» surəsinin ۲۱-ci ayəsində buyurulur: «Biz ən



---

.«Üsuli-kafi» [۱۷۲] -۱

böyük əzabdan əvvəl, onlara mütləq dünya əzabından daddıracağıq. Bəlkə, geri dönələr».

Bəli, peyğəmbərlər göndərilir, kitablar nazil olur, nemət verilir, bəlalar gəlir. Amma bütün bunlardan faydalanmayan insanların son mənzili, yalnız və yalnız cəhənnəmdir.

Əgər ətrafa nəzər salsaq, bir çox insanların məhz dünya əzabından nəticə çıxararaq, doğru yola gəldiyinə şahid olarıq. Nəfsin hakimiyyəti altında qarşılaşdıqda, dayanıb düşünür. Eyş-işrətə qərq olmuş cəmiyyət müdhiş bir zəlzələ qopan andaca, bir ağızdan «Allah»-deyə fəryad qoparır. Elm və məntiqlə həqiqəti tapmağa həvəs göstərməyənlər əzabla üzləşən kitmi, düşünməyə başlayır.

Dünya əzabı olmasaydı nə olardı? Allah-təala ۱۲۴ min peyğəmbər göndərib millətləri doğru yola çağırmaqla kifayətlənsəydi, dünya nə kökə düşərdi? Təsəvvür edin ki, bir cəmiyyətdə qanunlar təbliğ olunur, amma qanunu pozanlar cəzalandırılmır. «Oğurluq etməyin» deyilir, amma oğurluğun qarşısı alınmır. Bu cəzasızlıq oğurluğa rəvac vermirmi? Günahkarların cəzalandırılması, başqaları üçün ibrətdir və ümumiyyətlə, cəmiyyətin xeyirinə yönəldilmiş bir tədbirdir.

Allah-təala günahkarı cəzalandırmaqla onu islah olmağa, başqalarını isə ibrət götürməyə çağırır və belə bir əzab, bəşəriyyət üçün olduqca zəruridir.

## Sual ۱۵۴

Sual ۱۵۴: Peyğəmbərlər təqiyyə edibmi?

Cavab: «Təqiyyə» ərəbcədən tərcümədə «çəkinmək» mə´nasını verir, insanın öz dini baxışlarını izhar etməkdən çəkinməsidir. «Əhzab» surəsinin ۳۹-cu ayəsində oxuyuruq: «O peyğəmbərlər ki, Allahın hökmlərini təbliğ edər, Ondan çəkinər və Allahdan başqa kimsədən

qorxmazlar». Bu və digər ayələrdən mə´lum olur ki, peyğəmbərlərə öz risalətlərinin təbliğində təqiyyəyə icazə verilməmişdir.

Onu da unutmaq olmaz ki, təqiyyənin müxtəlif növləri vardır. Yuxarıdakı ayədə zikr olunan təqiyyə, qorxu təqiyyəsidir. Yə´ni peyğəmbərlər qorxu səbəbindən öz risalətini tə´xirə sala bilməz.

Təqiyyənin başqa bir növü, təhbibi təqiyyədir. İnsan bə´zən qarşı tərəfin məhəbbətini cəlb etmək üçün öz əqidəsini açıqlamır. Belə bir təqiyyə müəyyən müştərək işlərdə qarşı tərəflə həmkarlığa şərait yaradır.

Üçüncü növ təqiyyə, pərdələnmə təqiyyəsidir. Hər bir insan və ya cəmiyyət öz məqsədinə çatmaq üçün hazırladığı planı düşməndən gizlətməlidir. Aydın məsələdir ki, qarşı tərəfin atacağı addımlardan xəbərdar olan düşmən, öz tədbirini görəcəkdir.

Peyğəmbərlərə qorxu təqiyyəsi caiz olmasa da, onların həyatında ikinci və üçüncü növ təqiyyələr kifayət qədərdir. Məsələn, spirtli içkilərin mərhələ-mərhələ qadağan olunması, buna misal ola bilər. Bütləri qırmaq qərarına gəlmiş İbrahim bütpərəstlərə şənliyə getməyib, şəhərdə qalmasının səbəbini doğru-düzgün açıqlasaydı, məqsədinə çata bilərdimi?!

İmam Sadiq (ə) buyurur: «Təqiyyə mənim və mənim babalarımın ayinidir. Təqiyyəsi olmayanın dini yoxdur»(۱).

**Sual ۱۵۵**

Sual ۱۵۵: Peyğəmbərlik həvəsinə düşənləri necə anlatmalı?



---

۱- [۱۷۳] «Məcməül-bəyan», ۷-۸-ci cild, səh.۵۲۱.

Cavab: Allah-təala buyurur: «(Məhəmməd) Allahın rəsulu və peyğəmbərlərin sonuncusudur».(1)

Əlbəttə ki, ayə və hədislər yalnız mömin müsəlmanlar üçün mötəbərdir. Peyğəmbərlik eşqinə düşmüş fırıldaqçıları isə, yalnız elm və məntiq yolu ilə susdurmaq olar. Belə ki, heç bir peyğəmbər göndərildiyi cəmiyyətdə dəlil-sübutsuz qəbul olunmamışdır. Buna görə də, bu eşqə düşənlər öz peyğəmbərliklərini sübuta yetirmək üçün aşağıdakı tələblərə cavab verməlidirlər:

1. Bütün peyğəmbərlər möcüzə ilə göndərildiyindən, iddiaçı öz möcüzəsini göstərməlidir;

2. Bütün peyğəmbərlərin gəlişi özündən əvvəlki peyğəmbər tərəfindən xəbər verilmişdir;

İsa (ə) və onun gətirdiyi İncildə həzrət Məhəmməd (s) haqqında xəbərlər vardır. İddiaçı öz peyğəmbərliyinin sübutu üçün Qurandan dəlil gətirməlidir (Hansı ki, «Əhzab» surəsinin 40-cı ayəsində «Məhəmməd peyğəmbərlərin sonuncusudur»-deyə buyurulur).

3. Peyğəmbər öz dövrünün ən inkişaf etmiş elm sahəsində hamıdan üstün olmalıdır;

Necə ki, Musa möcüzədə, İsa tibbdə, Məhəmməd (s) məntiq və hikmətdə birinci idi.

4. Peyğəmbər cəmiyyətin bütün problemlərinin həlli yolunu göstərməyi bacarmalıdır;

5. Peyğəmbər zorakı hakimiyyətə qarşı çıxıb, ictimai ədalətin bərpasına çalışmalıdır;

6. Peyğəmbərin dininə hamıdan əvvəl onun ən yaxın adamları iman gətirməlidir və s.

## Sual 156

Sual 156: İslam peyğəmbərinin zövcələrinin sayının fəlsəfəsi nədir?



---

1- [174] «Əhzab» surəsi, ayə 40.

Cavab: Həzrət Məhəmmədin (s) bir yox, bir neçə qadınla evlənməsi, bir sıra ictimai-siyasi çətinliklərin həlli məqsədini daşımışdır. Həzrət öz peyğəmbərliyini elan etdiyi zaman tək-tənha idi və onun risalətinə çox az adam iman gətirmişdi. Təbii ki, xürafatın hakim olduğu həmin cəmiyyətdə əksər qəbilələr onun risalətinə müxalif mövqedə dayanmışdılar. Həzrət Peyğəmbər (s) düşmənin müqavimətini qırmaq üçün icazə .verilmiş bütün yollardan istifadə edirdi

Həzrət (s) yalnız bir bakirə qızla ... Aişə ilə evlənmişdir. ۲۵ yaşlı gənc, ۴۰ yaşlı dul qadınla .... Xədicə (s.ə.) evlənmiş və ۵۳ yaşınadək yalnız, bu qadınla nikahda olmuşdur

Öz dövrünün cahil adət-ənənələrini sındırmaq üçün dul Zeynəblə evlənən Peyğəmbər, .bakirə qızlarla da ailə həyatı qura bilərdi

Tarixçilər həzrət Məhəmmədin (s) zövcəsi sayılan qadınların əksəriyyətinin onunla cinsi yaxınlıqda olmadığını bildirirlər. Hətta bəzi qəbilələr öz qızını Həzrətə .nişanlamaqla kifayətlənmiş və bunu özləri üçün böyük fəxr hesab etmişlər

İkinci bir tərəfdən, sonsuz olmayan Peyğəmbərin (s) nə üçün az sayda övladı olmalı idi. Həmin dövrdə, adətən, övladla nəticələnən cinsi yaxınlıq, Həzrət (s) üçün önəmli deyildi. Önəmli olan, bu izdivaclar vasitəsi ilə qəbilələri İslama gətirmək, cəmiyyətdə .əlaqələri möhkəmlətmək idi

## Sual ۱۵۷

?Sual ۱۵۷: Evlənmək istədiyimiz qadına baxa bilərikmi

Cavab: Təfsirçilərin fikirincə, evlənmək istəyən şəxs evlənmək istədiyi qadına baxa .bilər

İnsan həyatında ən əhəmiyyətli hadisələrdən biri, izdivacdır. İslam dini bütün işlərdə kor-koranə seçimin əleyhinə olduğu kimi, izdivac zamanı da kamil bəsirət

tərəfdarıdır. Gələcəkdə baş verə biləcək peşmançılıqların qarşısını almaq üçün .evlənmək istəyən insan, nəzərdə tutduğu qadını şəriət çərçivəsində kamil tanımalıdır

Həzrət Peyğəmbər (s) evlənmək istəyən yaxın adamlarından birinə buyurur: .«Əvvəlcədən ona bax. Bu, aranızdakı məhəbbətin dərinliyinə səbəb olar

Əlbəttə ki, şəriət o şəxsə baxmaq icazə verir ki, onun bu qadınla evlənmək fikiri ciddi olsun. Evlənməyə qadın axtarmaq məqsədi ilə baxmaq, caiz deyil. Hətta icazə verildiyi .təqdirdə, şəhvətlə baxmaq haramdır

## Sual ۱۵۸

?Sual ۱۵۸: Qonaqdan ac olduğunu soruşmaq olarmı

Cavab: Həzrət Peyğəmbər (s) buyurur: «Qonaq behişt bələdçisidir»(۱). Qonağa ehtiram göstərilməsi o qədər əhəmiyyətlidir ki, İslam qonağı səmadan enmiş hədiyyə kimi təqdim edir. Həzrət Peyğəmbər (s) buyurur: «Qonaq öz ruzisi ilə gəlir və ailənin .«günahlarını özü ilə aparır

Qonağa böyük əhəmiyyət verilməsi ilə yanaşı, onu təmtəraqla qəbul etmək nəhy olunur. İslam qonağın sadə şəkildə qəbul edilməsini tövsiyə edərək məsləhət görür ki, .ev sahibi olanını müzayiqə etməsin, qonaq bunda artıq qəbulun intizarında olmasın

İmam Sadiq (ə) buyurur: «Qonaqdan yemək yeyib-içməyəcəyini soruşmayın. İmkan çatan həddə süfrə açın»(۲). Açılmış süfrəni kasıb bilərək, təhqir etmək caiz deyil. «Sizə layiq süfrə aça bilmədim» demək olmaz. İmam Sadiq (ə) buyurur: «Açılmış süfrəni əskik .«bilən ev sahibi və qonaq azğındır



---

.Biharul-ənvar», ۷۵-ci cild, səh. ۴۶۰» [۱۷۵] -۱

.Biharul-ənvar», ۷۵-ci cild, səh. ۴۵۵» [۱۷۶] -۲

Qonağın da öz vəzifələri vardır. Qonaq ona göstərilən yerdə oturmalı, ev sahibinin .narahatçılığına səbəb olacaq hərəkətlərə yol verməməlidir

### Sual ۱۵۹

?Sual ۱۵۹: İnsan öz ömrünü necə uzada bilər

Cavab: Bu sual bəşər tarixi boyun insanları düşündürmüşdür. Amma bu sahədə araşdırma aparan əksər tədqiqatçılar, məsələyə sırf fizioloji baxımdan yanaşmışlar. İslam dini fizioloji amillərin insan ömrünə təsirini nəinki inkar etmir, hətta bu sahədə göstərişlər də verir. İnsanın normal yuxu və qidalanma rejimi, onun ömrünün .uzunluğunda əhəmiyyətli rol oynayır

Amma bundan da əhəmiyyətli amillər vardır. Həzrət Peyğəmbər (s) buyurur: «Allah .(yolunda sədəqə və qohumları yoxlamaq evləri abad edib, ömürləri uzadar»(۱

Həzrət (s) öz buyuruqlarında zinanı məhkum edərək buyurur: «Ey müsəlmanlar, zinadan çəkinin. Onun altı pis nəticəsi vardır ki, üçü dünyada, üçü isə axirətdədir. Zinanın dünya həyatındakı üç təsiri bunlardır: insanın nurunu aparar, kasıblıq gətirər, .(ömürü qısaldar»(۲

Deməki, ömürünün qısalmasından ehtiyatlanaraq ekoloji saf qidalara üstünlük verən insan, öz mənəviyyatına da nəzər salmalıdır. İnsanın şərab içib-içməməsinin, zina edib-etməməsinin, qadının hicablı olub-olmamasının Allah üçün heç bir faydası yoxdur. İslam dinində nəzərdə tutulmuş bütün həddlər, yalnız və yalnız insanın dünya və axirət .səadətini təmin etmək üçündür

### Sual ۱۶۰

?Sual ۱۶۰: Ruhlarla əlaqə saxlamaq mümkündürmü



---

.Təfsiri Nurus-səqələyn», ۴-cü cild, səh. ۳۵۴» [۱۷۷] -۱

.Səfinətul-bihar», ۲-cild, səh.۲۳» [۱۷۸] -۲

Cavab: «Fatir» surəsinin ٢٢-ci ayəsində buyurulur: «Dirilərlə ölülər eyni deyillər. Şübhəsiz ki, Allah (haqq sözü) istədiyi şəxslərə eşitdirər. (Amma ey Peyğəmbər) sən isə .«qəbirlərdə olanlara eşitdirən deyilsən

Bədr döyüşündə öldürülmüş kafirlərə müraciətlə danışan Peyğəmbər (s), Ömərin etirazı ilə qarşılaşdı. Həzrət (s) «onların ki, ruhu yoxdur» deyən Ömərə belə cavab verdi: «Mənim dediklərimi siz onlardan yaxşı eşitmirsiniz. Sadəcə, onların cavab vermək .(qüdrəti yoxdur»(١

Bütün müsəlmanlar namazın sonunda peyğəmbərə salam göndərirlər. Dünyasını dəyişmiş insanın cəsədinə «la ilahə illəllah» təlqin edilir. Bütün bunlar mötəbər hədislərə əsasən icra olunur. Əgər dünyasını dəyişmiş insan bizi eşitmirsə, hansı əsasla ona !?salam göndərməli və ya təlqin etməliyik

Nəhcül-bəlağə»də ölülərin ruhu ilə əlaqəyə işarə olunur və həzrət Əlinin (ə)» .möminlərin ruhu ilə danışdığı bildirilir

Ölmüş insanın dünya həyatı ilə əlaqəsi kəsilsə də, Allahın iradəsi ilə belə bir əlaqə .mümkündür

### Sual ١۶١

Sual ١۶١: Qurani-kərimin ١١۴ surəsi olduğu halda, nə üçün «Yasin» surəsi daha çox ?tilavət olunur

Cavab: Bu surə «ya» və «sin» müqəttə hərfləri ilə başlayır. İmam Sadiq (ə) buyurur: «Yasin Allahın Rəsulunun adıdır. Çünki bunun ardınca buyurulur ki, «sən mürsəl (şəriət sahibi olan) peyğəmbərlərdənsən». Surədə yaranış, qiyamət, həyat və ölüm haqqında .müxtəlif səhnələrlə qarşılaşırıq



---

.«Ruhul-bəyan» [١٧٩] -١

Hədislərdə «Yasin» surəsi «Quranın qəlbi» adlandırılır. İmam Sadiq (ə) buyurur: «Bu surəni qürubdan əvvəl oxuyan insan gün uzunu hifz olunar və bol ruzidən faydalanar. Hər kəs bu surəni yatmazdan əvvəl oxusa, Allah min mələk məmur edər ki, onu hər .(şeytan və hər bəladan qorusun»(١

Lakin bu fəzilətlər surəni kor-koranə oxuyana yox, onun məfhumunu düşünüb, !anlayanlara şamildir. Elə bir düşüncə ki, insanın əməllərinə sirayət edir

**Sual ۱۶۲**

?Sual ۱۶۲: Yuxuya əməl etmək olarmı

Cavab: Yuxu üç qismdir: yozumu olan ilahi, doğru yuxular; insanı doğru yoldan azdıran şeytani yuxular; bir iş haqqında çox düşünməkdən yaranmış əsassız yorğunluq .yuxuları

İbrahim Peyğəmbər (ə) oğlu İsmayıli gördüyü yuxuya əsasən qurban kəsmək qərarına ?gəlmişdi. Maraqlıdır, insan yuxuya əsasən belə bir ciddi qərar qəbul edə bilərmi

Peyğəmbərlər bir sıra məsələlərdə, eləcə də yuxu məsələsində adi insanlardan fərqlənirlər. Onlar yalnız ilahi yuxular görür, bəzən isə vəhyi yuxu vasitəsi ilə qəbul .edirlər. Bəzi rəvayətlərdə İbrahimin uyğun yuxunu üç gecə ardıcıl gördüyü nəql olunur

Başqa bir rəvayətdə nəql olunur ki, şeytan İbrahimə, «gördüyün yuxu şeytani yuxudur» .deyə vəsvəsə edirdi. Amma İbrahim əmin idi ki, peyğəmbərlər şeytani yuxu görmürlər

Demək, adi insanların gördüyü yuxuya əsasən əməl etməsi, məntiqi deyildir və .yuxuda verilən göstərişə mütləq əməl olunması xürafatdır



---

.«Məcməul-bəyan» [۱۸۰] -۱

## Sual ۱۶۳

Sual ۱۶۳: Quran möminləri qələbə ilə müjdələdiyi halda, nə üçün bəzi möminlər ?şəhadətə yetişir

Cavab: «Qələbə» sözünün mənası olduqca genişdir. «Səffat» surəsinin ۱۷۲-ci ayəsində möminlərə belə bir vədə verilir: «Onlar mütləq qalib gələcəklər». Bəs nə üçün imam Hüseyn (ə) Kərbəla vaqiəsində şəhadətə yetişdi? Şəhadəti məğlubiyyət hesab etmək ?olarmı

Təsəvvür edin ki, bir peyğəmbər düşmənlə döyüşdə şəhadətə yetirilib. Amma onun dini cəmiyyəti öz təsiri altına alaraq, batil əqidələrə qalib gəlib. Diqqət etsək görərik ki, həmin peyğəmbər əslində qalib gəlmişdir. Qələbə bir insanı yox, onun əqidəsini sındırmaqdır. Bəli, imam Hüseyn (ə) Kərbəlada qətlə yetirildi. Lakin bütövlükdə Kərbəla .vaqiəsi İslamın taleyində tarixi dönüş nöqtəsinə çevrildi

Qələbənin digər bir növü, tədrici qələbədir. Belə bir qələbə əsrlərcə davam edən .mübarizədən, neçə-neçə nəsillərin şəhadətə yetişməsindən sonra əldə edilir

Ən əsas nöqtələrdən biri isə, əbədiyyət məsələsidir. Yəni dünya səadəti axirət səadəti demək deyildir. ۷۰ illik bir ömürü xoşbəxt yaşayan insanı, xoşbəxt adlandırmaq olmaz. Əsl xoşbəxtlik axirət xoşbəxtliyidir. Əgər imam Hüseyn (ə) şəhid olaqla behiştə gedirsə, demək qalib gəlir. Yox, onu qətlə yetirən Şimr cəhənnəm oduna bələnirsə, .demək əslində məğlub olur

## Sual ۱۶۴

?Sual ۱۶۴: Gözdəymə həqiqətdirmi

Cavab: Bir çox insanların gözündə xüsusi bir təsir olduğu barədə gəzən söz-söhbətlərdə həqiqət varmı? Həzrət Peyğəmbərdən (s) bu barədə soruşulduqda, o .(buyurdu: «Qəzavü-qədəri qabaqlaya biləcək şey gözdəymədir»(۱

Yəqub peyğəmbər öz övladlarını məhz gözdəymədən qorumaq məqsədi ilə deyir: «Yəqub dedi: «Oğullarım! Misirə eyni bir qapıdan girməyin, ayrı-ayrı qapılardan daxil olun...»(١). Həzrət Əli (ə) buyurur: «Peyğəmbər (s) Həsən (ə) və Hüseyn (ə) üçün gödəymə duası hazırlamışdı»(٢). Həzrət «Nəhcül-bəlağə»də bir daha buyurur: .««Gözdəymə, eləcə də onu aradan qaldırmaq üçün dua, həqiqətdir

Amma İslamda gözdəymənin bir həqiqət kimi qəbul edilməsi kimsəyə əsas vermir ki, bu sahədə xürafat həddinə yetişsin. Bu sahədə dinin göstərişlərindən kənara çıxaraq, .ifrata varmaq caiz deyil

## Sual ١۶۵

?Sual ١۶۵: Bağışlanmayan günah varmı

Cavab: «Zumər» surəsinin ۵٣-cü ayəsində buyurulur: «De ki, ey mənim özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah bütün .«!günahları bağışlayar. Həqiqətən, O, bağışlayan və rəhm edəndir

Bu ayənin nazil olma səbəbi kimi, bəzi təfsirçilər Vəhşinin dastanını göstərirlər. Vəhşi həzrət Peyğəmbərin (s) əmisi Həmzənin qatilidir. Özünü hər zaman Peyğəmbərə (s) .sipər etmiş Həmzə, Vəhşi tərəfindən namərdliklə qətlə yetirilmişdi

Zaman keçdi. İslam qüdrətləndi. Vəhşi də İslam dinini qəbul etmək qərarına gəldi. Həzrət Peyğəmbər (s) «Əmim Həmzəni necə öldürdün» soruşdu. Vəhşi həmin səhnəni təsvir etdiyi zaman, Həzrət (s) bərk ağlayırdı. Amma Vəhşinin tövbəsi qəbul oldu. :Həzrət (s) ona buyurdu



---

.Yusif» surəsi, ayə ۶٧» [١٨٢] -١

.Nurus-səqəleyn», ۵-ci cild, səh. ۴٠٠» [١٨٣] -٢

Mənim gözümə görünmə, sənə baxa bilmirəm». Vəhşi Şam istiqamətində gedib, bir»
.daha gözə görünmədi

Həzrətdən (s) soruşdular ki, bu ayə təkzə Vəhşiyə aiddir, yoxsa hamıya? Peyğəmbər,
.«hamıya!» -deyə cavab verdi

### Sual ۱۶۶

?Sual ۱۶۶: «İsrafilin suru» nədir

Cavab: «Zumər» surəsinin ۶۸-ci ayəsində buyurulur: «Sur çalınacaq, Allahın istədiyi kimsələrdən başqa, dərhal hamı öləcək. Sonra bir daha çalınan kimi, onlar qalxıb
.«!müntəzir olacaqlar

Necə ola bilər ki, səs dalğaları bütün dünyanı bürüyə? Bir halda ki səs sürəti saniyədə
?۲۴۰ metri aşmır, bir Surun səsi bütün yer üzünə necə yayıla bilər

Rəvayətlərə əsaslanaraq deyə bilərik ki, Sur adi bir şeypur deyildir: İmam Zeynəlabidin (ə) buyurur: «Sur böyük bir buynuzdur. Yerə yönəlmiş aşağı ucla səmaya yönəlmiş yuxarı uc yeddinci qatınadəkdir. Onun üzərində ruhların sayı qədər dəlik vardır». Həzrət Peyğəmbər (s) buyurur: «Sur nurdan olan bir buynuzdur və üzərində
.(ruhların sayı qədər dəlik vardır»(۱)

Surun nurdan olması, bu səsin sürətinin saniyədə ۳۰۰.۰۰۰ km işıq sürtindən çox
.olmasına bir işarədir

### Sual ۱۶۷

?Sual ۱۶۷: Özünü islah etməmiş insan, başqalarını islah edə bilərmi

Cavab: İslam dini öz ardıcıllarını cəmiyyətin islahına çağırır. Ümumiyyətlə, müəyyən bir
,yola bağlanmış insan



---

.Elmül-yəqin», səh.۸۹۲» [۱۸۴] -۱

fitri olaraq başqalarını da bu yolda görmək istəyir. Amma bu işdə heç də hamı .müvəffəq deyildir

Qurani-kərimdə «Allaha tərəf çağırın»-deyə əmr olunur və bu çağırışın proqramı təqdim olunur. «Fussilət» surəsinin ۳۳-۳۶-cı ayələrinə əsasən, təfsirçilər Allaha tərəf :çağırışın dörd mərhələsini qeyd edirlər

;Dəvət edənlər iman və əməl baxımından özlərini islah etməlidirlər .۱

;Pisliklər yaxışlıqla aradan qaldırılmalıdır .۲

;Əxlaq qaydalarına əməl olunmalıdır .۳

.Maneələr aradan qaldırılmalı, şeytanın vəsvəsələri ilə mübarizə aparılmalıdır .۴

Nurus-səqəleyn»də oxuyuruq: «Allah-təala öz peyğəmbərinə buyurur ki, yaxşılıqla» pislik eyni deyildir, pisliyi ən yaxşı üsulla aradan qaldır. Yəni sənə pislik edənlərə .(yaxşılıqla cavab ver. Bu halda düşmən səmimi dosta çevrilər»(۱

**Sual ۱۶۸**

?Sual ۱۶۸: Həzrət Məhəmməd (s) İslamdan əvvəl hansı dində idi

Cavab: Həzrət Peyğəmbərin həyat tarixçəsində aparılan araşdırmalar sübut edir ki, İslamdan əvvəl Məkkə əhli bütpərəst olsa da, Həzrət yalnız bir olan Allaha etiqad .etmişdir

Təfsirçilər arasında Həzrətin (s) hansı dində olması barədə müxtəlif rəylər olsa da, ən məntiqi nəzər budur ki, İslam ona nazil olanadək, Rəsuləllah (s) Allahın yalnız onun .üçün müəyyənləşdirdiyi bir proqrama əməl etmişdir

Nəhcül-bəlağə»də buyurulur: «Allah-təala Məhəmməd (s) süddən ayrılan zamandan» ,başlayaraq



---

.cü cild, səh. ۵۴۹-۴ [۱۸۵] -۱

.(ən əzəmətli mələyi ilə onu doğru yol və doğru əxlaqa sövq etmişdir

Əllamə Məclisi rəvayətlərə əsaslanaraq bildirir ki, həzrət Məhəmməd (s) peyğəmbərlikdən əvvəl də peyğəmbərlik məqamında olmuşdur. Daim mələklərin .səsini eşitmiş, yuxularından ilham almışdır

Belə ki, qətiyyətlə deyə bilərik ki, həzrət Peyğəmbər (s) İslam qədərki dövrdə nə .məsihi, nə də yəhudi dinində olmamışdır

## Sual ۱۶۹

?Sual ۱۶۹: İmanın hansı mərhələləri vardır

Qurani-kərimdə buyurulur ki, Allah-təala hər bir insanı onun qüvvəsi həddində sorğuya çəkir. Deməli, iman dərəcəsi aşağı olan insanların sorğusu daha yüngül keçəcəkdir. Həzrət Peyğəmbər (s) və onun Əhli-beytindən nəql olunmuş hədislərdə iman səviyyəsi aşağı olan insanları qınamamaq tövsiyə olunur. Amma deyilənlərdən belə nəticə çıxarmaq yanlış olar ki, tamam imansız … kafir insanlara sorğu yoxdur. İman bütün bəşəriyyətin fitrətinə məxsus olan bir sifətdir. Sorğudan gəzəştlər isə, birbaş insanların istedadı ilə bağlıdır. Atəşin İbrahimə gülzara döndüyünü görən Nəmrud, Allahın qüdrəti qarşısında qurban kəsir. Amma yenə də dünyəvi məqamını .itirmək qorxusundan, aşkar iman gətirməyib kafirlərdən olur

səh:۱۵۴

**Sual ۱۷۰**

?Sual ۱۷۰: İman eşqdir, yoxsa ağılın dərki

Cavab: Qurani-kərimin «Hücərat» surəsinin ۷-ci ayəsində buyurulur: «...Allah sizə imanı sevdirmiş, onu, ürəklərinizdə süsləmiş küfrə, asi olmağa qarşı nifrət oyatmışdır».

Adətən, insanlar həqiqətin qəbulu üçün dəlil-sübut istəyirlər. Belə bir istək təbiidir və İslam tərəfindən inkar olunmur. Amma insan qəbul etdiyi həqiqəti sevməyə də bilər. İmam Sadiq (ə) buyurur: «İman, sevgi və nifrətdən başqa bir şey deyil» buyurur.

İmam Baqir (ə) buyurur: «Din məhəbbət, məhəbbət isə dindir».

Təsadüfü deyildir ki, kainatın obyektiv nizamlı quruluşunu dərindən mütaliə edən astronom Allahın varlığını təsdiqlədiyi halda, ibadət etməyə də bilər. Əksinə, bu dəlillərdən tamami ilə xəbərsiz, yalnız fitrətinin səsini dinləməklə iman gətirmiş savadsız çoban, heç bir şəkk-şübhəyə yol vermədən Allahına ibadət edir!

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok١٢٩/٣٤-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ٠٠٩٨٣١٣۴۴٩٠١٢۵

Tehran ofisi: ٠٠٩٨٢١٨٨٣١٨٧٢٢

Biznes və alqı satqı: ٠٠٩٨٩١٣٢٠٠٠١٠٩

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ٠٠٩٨٩١٣٢٠٠٠١٠٩